QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Aprel 2015 04 (1068)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## 1941-1945-ci illər Böyük Vətən müharibəsi iştirakçılarına, həlak olmuş və ya sonralar vəfat etmiş döyüşçülərin dul arvadlarına, arxa cəbhədə fədakar əməyinə görə orden və medallarla təltif edilmişşəxslərə birdəfəlik maddi yardım verilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, 1941-1945-ci illər Böyük Vətən müharibəsində Qələbənin 70-ci ildönümü ilə əlaqədar **qərara alıram:**

1. 1941-1945-ci illər Böyük Vətən müharibəsi iştirakçılarına 800,0 (səkkiz yüz) manat məbləğində, Böyük Vətən müharibəsində həlak olmuş və ya sonralar vəfat etmiş döyüşçülərin dul arvadlarına, həmin dövrdə arxa cəbhədə fədakar əməyinə görə orden və medallarla təltif edilmiş şəxslərə, İkinci Dünya müharibəsi illərində döyüş cəbhələrinin arxa hüdudları, yaxud döyüşən donanmaların əməliyyat zonaları daxilində ordunun və donanmanın mənafeyi üçün tapşırıqları yerinə yetirmiş xüsusi birləşmələrin işçilərinə, Böyük Vətən müharibəsi dövründə Leninqrad şəhərinin müdafiəsinə görə müvafiq medal və döş nişanı ilə təltif edilmiş şəxslərə, habelə Leninqrad şəhərinin mühasirəsi iştirakçılarına 400,0 (dörd yüz) manat məbləğində birdəfəlik maddi yardım verilsin.

2. Bu sərəncamın 1-ci hissəsinin icrası məqsədi ilə:

2.1. Azərbaycan Respublikasının 2015-ci il dövlət büdcəsində nəzərdə tutulmuş Azərbaycan Respublikası Prezidentinin Ehtiyat Fondundan 8,3 milyon (səkkiz milyon üç yüz min) manat ayrılsın;

2.2. Azərbaycan Respublikasının Maliyyə Nazirliyi həmin vəsaitin Azərbaycan Respublikasının Dövlət Sosial Müdafiə Fondunun xüsusi hesabına köçürülməsini təmin etsin;

2.3. Azərbaycan Respublikasının Dövlət Sosial Müdafiə Fondu birdəfəlik maddi yardımın bu sərəncamın 1-ci hissəsində nəzərdə tutulmuş şəxslərə çatdırılmasını təmin etsin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 3 aprel 2015-ci il*

## İmtahan sessiyasının təşkili və keçirilməsi barədə

### *Azərbaycan Respublikası təhsil nazirinin əmri*

Ali təhsil müəssisələrində 2014/2015-ci tədris ilinin yaz semestrinin imtahan sessiyası (bundan sonra imtahan sessiyası) mövcud qaydalara uyğun təşkil etmək, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığı və obyektivliyi təmin etmək məqsədilə

**ƏMR EDİRƏM:**

1. 2015-ci ildə Bakı şəhərində I Avropa Oyunlarının keçirilməsi ilə əlaqədar Bakı şəhərində yerləşən ali təhsil müəssisələrində yaz semestrinin imtahan sessiyası 11 may 2015-ci il tarixindən başlasın və 31 may 2015-ci il tarixində sona çatsın.

2. Ali təhsil müəssisələrinin rəhbərləri:

- imtahan sessiyasının mövcud normativ sənədlər əsasında təşkil olunmasını təmin etsinlər;
- imtahanlara buraxılacaq tələbələrin siyahısını dəqiqləşdirsinlər;
- rəhbərlik etdikləri ali təhsil müəssisələrində imtahan qərargahı yaratsınlar və qərargaha daxil olan hər bir şikayətin qısa müddətdə operativ şəkildə araşdırılmasını təmin etsinlər;
- imtahan sessiyasında şəffaflığı təmin etmək üçün imtahanlarda ictimaiyyətin və valideynlərin iştirakına şərait yaratsınlar;
- imtahanların təşkilində və gedişində nöqsanlara, neqativ hallara yol vermiş şəxslər barədə mövcud qanunvericiliyə uyğun tədbirlər görsünlər;
- nəzərə alsınlar ki, rəhbərlik etdikləri ali təhsil müəssisəsində baş verə biləcək hər bir neqativ hala görə məsuliyyət daşıyırlar;
- imtahan sessiyasının təşkili, keçirilməsi və nəticələri barədə sessiya bitdikdən sonra 10 gün müddətinə Təhsil Nazirliyinə yekun hesabat versinlər.

3. Elm və ali təhsil (G.Hüseynova) və Daxili nəzarət (K.Quliyev) şöbələrinə tapşırılsın:

- imtahan sessiyasına hazırlıq dövründə və sessiya müddətində ali təhsil müəssisələrində baş vermiş neqativ hallarla bağlı daxil olan məlumatları operativ araşdırsınlar və onların yol verilməsində günahı olan şəxslər barədə tədbir görmək üçün təkliflər hazırlasınlar;
- ali təhsil müəssisələrində yaz semestrinin imtahan sessiyalarının nəticələrini təhlil edib müvafiq arayışları müzakirəyə təqdim etsinlər.

4. İnformasiya şöbəsi (E.Əliyev) Təhsil Nazirliyinin "Qaynar xətt" xidmətinin fəaliyyəti və imtahan sessiyasının gedişi barədə kütləvi informasiya vasitələrinə müntəzəm olaraq məlumat verilməsini təmin etsin.

5. Əmr "Azərbaycan müəllimi" qəzetində dərc edilsin və nazirliyin internet saytında yerləşdirilsin.

6. Əmrin icrasına nəzarət nazir müavini C.Bayramova həvalə edilsin.

**Mikayıl CABBAROV,**
**Azərbaycan Respublikasının təhsil naziri**

*15 aprel 2015-ci il*

## ADPU-da ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş "Müəllim hazırlama siyasəti və problemləri" mövzusunda V Beynəlxalq Konfrans keçirilib





Aprel ayının 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), Türkiyə Respublikasının Hacəttəpə Universitetinin və Qafqaz Universitetinin birgə təşkilatçılığı ilə ADPU-da Türk dünyasının böyük dövlət xadimi, mahir və müdrik siyasətçi, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş "Müəllim hazırlama siyasəti və problemləri" mövzusunda V Beynəlxalq Konfrans keçirilib. Qeyd edək ki, 2007-ci ildən başlayaraq hər iki ölkədə bu mövzuda keçirilən konfranslar artıq ənənəvi xarakter almışdır. Konfrans iştirakçıları konfrans başlamazdan öncə Fəxri Xiyabanda ulu öndər Heydər Əliyevin məzarını ziyarət edib, məzarı önünə əklil və gül dəstələri qoyublar. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri qoyulub. Sonra ADPU-nun Böyük zalında konfransın açılış mərasimi keçiri-

**(Davamı 2-ci səhifədə)**

# ADPU-da ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş “Müəllim hazırlama siyasəti və problemləri” mövzusunda V Beynəlxalq Konfrans keçirilib

(Əvvəli 1-ci səhifədə)




lib. Açılış mərasimində ilk olaraq Azərbaycanın və Türkiyənin dövlət himnləri səsləndirilib, Türk dünyasının ulu öndərləri Heydər Əliyevin və Mustafa Kamal Atatürkün əziz xatirələri bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov beynəlxalq konfransı giriş sözü ilə açaraq bildirib ki, “Təhsil millətin gələcəyidir!” deyən ümummilli liderimiz Heydər Əliyev öz zəngin idarəçilik və dövlətçilik fəaliyyətində həmişə elm və təhsilə yüksək qiymət vermişdir. Qeyd edək ki, Təhsil naziri cənab Mikayıl Cabbarov bu il fevral ayının 20-də xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü ilə əlaqədar təhsil müəssisələrində keçiriləcək tədbirlər haqqında 203 nömrəli əmr imzalamışdır. Həmin əmrlə ulu öndər Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü ilə əlaqədar Təhsil Nazirliyinin Fəaliyyət Planı təsdiq edilmişdir. Fəaliyyət Planında gerçəkləşməsi nəzərdə tutulan əsas tədbirlərdən biri də ölkənin ali təhsil müəssisələrində onların peşə-ixtisas istiqamətlərinə uyğun olaraq ümummilli lider Heydər Əliyevin dövlət quruculuğunun, elm, təhsil və mədəniyyətin, həmçinin iqtisadiyyatın, idmanın inkişafındakı roluna həsr olunmuş elmi və elmi-praktik konfransların keçirilməsidir. Bununla yanaşı, ADPU-da imzalanmış müvafiq əmrlə universitetdə bu il keçiriləcək respublika və beynəlxalq elmi konfranslar, simpozium və konqreslərlə bağlı tədbirlər planı təsdiqlənmişdir. Bizim bu gün keçirdiyimiz beynəlxalq konfrans da yuxarıda qeyd etdiyim əmrlərin icrasına uyğun olaraq keçirilən silsilə elmi tədbirlərdən biridir. Bugünkü beynəlxalq konfransın keçirilməsi üçün mənim sədrliyimlə və Hacəttəpə Universitetinin rektoru, professor-doktor hörmətli Murat Tuncer və Qafqaz Universitetinin rektoru, professor-doktor hörmətli Ahmet Saniçin həmsədrliyi ilə 30 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılmış və bu Təşkilat Komitəsi konfransın yüksək səviyyədə keçirilməsi üçün qarşılıqlı əlaqədə səmərəli fəaliyyət göstərmişdir. 3 gün davam edəcək konfransın açılışı, plenar iclası və bölmə iclaslarının bir hissəsi bu gün ADPU-da keçirilir, bölmə iclaslarının davamı və konfransın yekun iclası isə may ayının 1-də Qafqaz Universitetində keçiriləcəkdir.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, mart ayından başlayaraq ADPU-da ulu öndər Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə müxtəlif tədbirlər həyata keçirilir. Belə ki, mart ayının 12-də ADPU-nun Tarix fakültəsi Təhsil Nazirliyinin Bakı Şəhəri üzrə Təhsil İdarəsinin Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbi ilə birlikdə “Ulu öndər Heydər Əliyev və milli-mənəvi dəyərlərimiz“ mövzusunda tədbir, mart ayının 17-də isə ADPU Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutu ilə birlikdə “Azərbaycan təhsilinin aktual problemləri - təbiət, fundamental, humanitar və pedaqoji fənlərin tədrisində yeni istiqamətlər” mövzusunda respublika elmi-praktik konfransı keçirmişdir. Aprel ayının 6-da ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə ADPU-nun Pedaqoji fakültəsinin Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının professor-müəllim heyətinin son illər çap edilmiş elmi əsərlərinin təqdimatı, aprel ayının 13-də isə ADPU-da respublikamızın ali məktəb tələbələri arasında bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi keçirilmişdir. ADPU həmçinin Təhsil Problemləri İnstitutu ilə birlikdə aprelin 17-də ulu öndərimiz Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş “Xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətə inteqrasiyası və sosial adaptasiyası” mövzusunda respublika elmi konfransı keçirmişdir.

Bu elmi tədbirlərlə yanaşı, may ayında ADPU-da ulu öndər Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr edilmiş inşa yazı müsabiqəsi, idman yarışları keçiriləcək, sərgi təşkil olunacaq. May ayının 8-də ADPU-da ilk dərs saatları ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinə həsr olunacaq, eyni zamanda həmin gün universitetin rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi əvvəlcə Fəxri Xiyabanda Ulu Öndərin məzarını ziyarət edəcək, sonra isə Böyük zalda mərasim keçirəcəkdir. Həmin gün ADPU həm də Qərb Universiteti ilə birlikdə “Heydər Əliyev məktəbinin lektoriyası” nda “Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan” mövzusunda respublika elmi konfransı keçirəcəkdir.

Rektor Y.Məmmədov çıxışının bu məqamında ulu öndər Heydər Əliyevin müəllimlik peşəsinə verdiyi çox yüksək qiymətə xüsusi toxunub. Ulu Öndər demişdir: “Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Azərbaycan ziyalıları arasında müəllimlər xüsusi yer tuturlar, hörmətə layiqdirlər və xüsusi qayğı ilə əhatə olunmalıdırlar. Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Bizim hər birimizi bu səviyyəyə çatdıran məktəbdir, məktəbdə dərs deyən isə müəllimdir. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram”.

Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev də müəllim adına, müəllim əməyinə yüksək qiymət verir. Dövlət başçımız 2007-ci il sentyabr ayının 4-də “Ən yaxşı ümumtəhsil müəssisəsi” və “Ən yaxşı müəllim” müsabiqələrinin keçirilməsi haqqında sərəncamlar imzalamışdır. Həmin vaxtdan başlayaraq hər il “Ən yaxşı müəllim” müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 100 nəfər müəllim 5 min manat məbləğində, eləcə də “Ən yaxşı ümumtəhsil müəssisəsi” müsabiqəsində müvəffəqiyyət qazandıqlarına görə 50 ümumtəhsil müəssisəsi 10 min manat məbləğində birdəfəlik pul mükafatı ilə mükafatlandırılır. Bugünədək 700 nəfər müəllim “Ən yaxşı müəllim”, 350 məktəb isə “Ən yaxşı ümumtəhsil müəssisəsi” adına layiq görülmüşdür. Dövlət başçımızın bu sərəncamları təbii ki, cəmiyyətdə müəllim adının, müəllim nüfuzunun yüksəldilməsinə xidmət edir. Eyni zamanda təhsilin inkişafındakı xüsusi xidmətlərinə görə fərqlənən müəllimlər müxtəlif orden və medallarla təltif edilir, yüksək fəxri adlara layiq görülürlər.



Dövlət başçımızın 2013-cü il oktyabr ayının 24-də “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” və 2015-ci il yanvar ayının 19-da “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı” nın təsdiq edilməsi haqqında imzaladığı sərəncamlarda gənclərin peşə oriyentasiyası və pedaqoji fəaliyyətin stimullaşdırılması xüsusi yer tutur. Təhsil Nazirliyi bu məqsədlə 2014-2015-ci tədris ilində qəbul imtahanları zamanı 500 və 500-dən çox bal toplayan və ixtisas seçimi zamanı ilk olaraq müəllimlik ixtisasını seçən 300 abituriyentə təqaüddən əlavə 100 manat təqaüd verilməsi barədə qərar qəbul etmişdir.

Rektor Y.Məmmədov öz maraqlı və məzmunlu çıxışında qeyd edib ki, ADPU son illər Türkiyə Respublikasının Hacəttəpə Universiteti, Mehmet Akif Ersoy Universiteti və digər qabaqcıl universitetləri, eləcə də Rumıniyanın və Avropanın çox nüfuzlu Babeş-Bolyai Universiteti, Fransanın Strasburq Universiteti, Rusiya universitetləri, Baltikyanı ölkələrin universitetləri və digər xarici universitetlərlə sıx əməkdaşlıq edir. ADPU həmçinin Avropa və Amerikanın 60-dan çox qabaqcıl və nüfuzlu universitetini özündə birləşdirən ETEN-ə (Avropa Müəllim Hazırlayan Ali Məktəblər Birliyi) və Qara Dəniz Hövzəsi Ölkələrinin Universitetləri Assosiasiyasına üzv seçilmişdir. ADPU fəaliyyət göstərdiyi 94 il ərzində ölkəmiz üçün 150 mindən çox yüksəkixtisaslı pedaqoji kadr hazırlamışdır.

V Beynəlxalq Konfransda Hacəttəpə Universitetinin prorektoru, professor-doktor Yüksel Kavak, Qafqaz Universitetinin rektoru, professor-doktor Ahmet Saniç, Hacəttəpə Universitetinin Pedaqoji fakültəsinin dekanı, professor-doktor Celal Bayrak, ADPU-nun Pedaqoji fakültəsinin dekanı, professor, Əməkdar elm xadimi Fərrux Rüstəmov, Təhsil Şurasının sədri, Qafqaz Universitetinin kafedra müdiri, professor Əjdər Ağayev, Təhsil Problemləri İnstitutunun direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov, Bakı Dövlət Universitetinin (BDU), Psixologiya fakültəsinin dekanı, professor Hikmət Əlizadə çıxış edərək bugünkü konfransın aktual bir mövzuya həsr olunduğunu və bu yüksək səviyyəli elmi tədbirin iki ölkə arasında mədəni-siyasi əlaqələrin inkişafına, eləcə də təhsil sahəsində həyata keçirilən əməkdaşlığa səmərəli təsir edəcəyini vurğulayaraq konfransın işinə uğurlar arzulayıblar.

Qeyd edək ki, konfransda Hacəttəpə Universiteti və Qafqaz Universiteti ilə yanaşı, Ankara Universitetinin, Sakarya Universitetinin, Təhsil Nazirliyinin (TN), Türkiyənin Azərbaycandakı səfirliyinin, Səbail Rayon İcra Hakimiyyətinin (RİH), Bakı Şəhəri üzrə Təhsil İdarəsinin nümayəndələri (BŞTİ) , BDU-nun, Azərbaycan Tibb Universitetinin (ATU), Azərbaycan Dillər Universitetinin (ADU), Bakı Slavyan Universitetinin (BSU), Azərbaycan Memarlıq və İnşaat Universitetinin(AzMİU) Azərbaycan Texniki Universitetinin (AzTU), Sumqayıt Dövlət Universitetinin (SDU), Azərbaycan Müəllimlər İnstitutunun (AMİ), Lənkəran Dövlət Universitetinin (LDU), Odlar Yurdu Universitetinin(OYU), Qərb Universitetinin (QU) və digər ali təhsil müəssisələrinin professor-müəllimləri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA), Təhsil Problemləri İnstitutunun (TPİ), Bakı Pedaqoji Kadrların İxtisasartırması və Yenidənhazırlanması İnstitutunun (BPKİYİ) alim və mütəxəssisləri iştirak ediblər.

Konfransın plenar iclasında giriş nitqlərindən başqa çıxışlar və təbriklər dinlənilib. Konfransın bölmə iclaslarında isə müəllim hazırlığında müasir texnologiyalardan istifadə, qloballaşan dünyada müəllim hazırlığına müasir baxış, müəllim şəxsiyyətinin formalaşdırılmasının əsas istiqamətləri, fənn müəllimi hazırlığının yeni məzmunu və müəllim standartları, müəllim hazırlama siyasəti və problemləri ilə bağlı 6 bölmə üzrə 175 məruzə dinlənilib.



**Mənsur İBRAHİMLİ,**
**Könül NƏZƏROVA**

# ADPU-da ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş "Xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətə inteqrasiyası və sosial adaptasiyası" mövzusunda respublika elmi konfransı keçirilib

**Aprel ayının 17-də Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutu ilə birlikdə görkəmli ictimai-siyasi xadim, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş "Xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətə inteqrasiyası və sosial adaptasiyası" mövzusunda respublika elmi konfransı keçirib. Konfransda Təhsil Nazirliyinin, Azərbaycan Respublikasının İnsan Hüquqları üzrə Müvəkkilinin (Ombudsman), Bakı Şəhər İcra Hakimiyyətinin əməkdaşları, Bakı Dövlət Universitetinin (BDU), Azərbaycan Müəllimlər İnstitutunun (AMİ) və digər ali təhsil müəssisələrinin professor-müəllimləri, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin və xüsusi təhsil müəssisələrinin, həmçinin Polşanın**







**və Pakistanın Azərbaycandakı səfirliklərinin nümayəndələri, habelə Türkiyədən və Almaniyadan gəlmiş alim və mütəxəssislər, eləcə də qeyri-hökümət təşkilatlarının, ictimai birliklərin təmsilçiləri iştirak ediblər.**

Konfrans iştirakçıları əvvəlcə ulu öndər Heydər Əliyevin ADPU-dakı abidəsini ziyarət edərək önünə gül dəstələri qoyublar, sonra universitetin Pedaqogika və psixologiya fakültəsinin professor-müəllimlərinin və tələbə- gənclərinin, həmçinin xüsusi qayğıya ehtiyacı olan uşaqların özlərinin bu sahə ilə bağlı hazırladıqları dərslik, dərs vəsaitləri və rəsm əsərlərindən ibarət sərgi ilə tanış olublar, daha sonra isə universitetin Böyük zalında konfransın açılışı olub. Konfransın plenar iclasının açılışında ilk olaraq ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru,AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov konfransı giriş sözü ilə açaraq bildirib ki, ulu öndərimiz Heydər Əliyev həmişə xalqımızın bütün təbəqələrinə, o cümlədən xüsusi qayğıya ehtiyacı olan uşaqlara böyük diqqət göstərib, onların təhsilə cəlb edilmələri və digər problemlərin həlli üçün dövlət səviyyəsində müvafiq tədbirlər həyata keçirib. Hazırda ulu öndərimiz Heydər Əliyevin elmi əsaslara söykənən dövlətçilik kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev həmin qayğı və diqqəti yüksək səviyyədə davam etdirir. Dövlət başçımızın 2013-cü il oktyabr ayının 24-də imzaladığı "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" və 2015-ci il yanvar ayının 19-da "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı" nın təsdiq edilməsi haqqında imzaladığı sərəncamlarda xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsilə cəlb edilmələri, onların cəmiyyətə inteqrasiyası və sosial adaptasiyası kimi vacib məqamlar xüsusi yer alıb. Eyni zamanda Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Milli Məclisin deputatı Mehriban xanım Əliyeva bu qəbildən olan uşaqların problemlərin həlli istiqamətində müxtəlif layihələr həyata keçirir və bu layihələr öz müsbət nəticələrini verir.




Rektor Y.Məmmədov çıxışının sonunda bugünkü respublika elmi konfransının keçirilməsinə görə ADPU-nun Pedaqogika və psixologiya fakültəsinin rəhbərliyinə, professor - müəllim heyətinə və tələbə kollektivinə, eləcə də Təhsil Problemləri İnstitutunun rəhbərliyinə öz təşəkkürünü bildirib.

Təhsil Problemləri İnstitutunun direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov konfranda çıxış edərək bildirib ki, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" nda və Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı" nda sağlamlıq imkanları məhdud olan uşaqların inklüziv təhsilə cəlb edilmələri ən mühüm müddəalardan biridir. Son 20 ildə dünyada xüsusi qayğıya ehtiyacı olan uşaqlarla bağlı böyük işlər görülür. BMT və UNİCEF bu istiqamətdə səmərəli fəaliyyət göstərir. Statistikaya görə, hazırda dünyada təxminən 70 milyona yaxın sağlamlıq imkanları məhdud olan uşaq var ki, onların 65 milyonu ibtidai sinif yaşlı uşaqlardır. Bu ibtidai sinif yaşlı uşaqların 97 faizi təhsildən kənarda qalıb. Azərbaycanda isə təxminən 65 minə yaxın belə uşaq var ki, onların da təxminən 47-48 mini təhsilə cəlb edilməyib. Hazırda ölkəmizdə onların təhsilə cəlb edilmələri üçün dövlət səviyyəsində lazımi tədbirlər həyata keçirilir.

Konfransda Təhsil Nazirliyinin De-İnstitutlaşma və uşaqların müdafiəsi idarəsinin müdiri Məlahət Hacıyeva, ADPU-nun Pedaqogika və psixologiya fakültəsinin dekanı,dosent Şəhla Əliyeva məruzə ilə çıxış edərək müasir dövrdə ölkəmizdə xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətə inteqrasiyası, belə uşaqlar üçün bərabər təhsil hüququ imkanlarının yaradılması, o




cümlədən məktəbəqədər təhsil müəssisələrində inklüziv təhsilin təşkilinin əsas istiqamətləri ilə bağlı öz fikir və mülahizələrini konfrans iştirakçıları ilə bölüşüblər. Konfransda çıxış edən aidiyyətli təşkilatların nümayəndələri və bu sahənin tanınmış mütəxəssisləri bugunkü konfransın aktual bir mövzuya həsr olunduğunu bildiriblər və konfrans işinə uğurlar arzulayıblar.

Konfransda ulu öndər Heydər Əliyevin, eyni zamanda Azərbaycan Prezidenti İlham Əliyevin və Mehriban xanım Əliyevanın sağlamlıq imkanları məhdud olan uşaqlara qayğı və diqqətini əks etdirən videoçarx nümayiş etdirilib, həmçinin xüsusi qayğıya ehtiyacı olan uşaqlar milli rəqslərimizi ifa ediblər.

Qeyd edək ki, konfransda 3 bölmə üzrə 85 məruzə dinlənilib. Bir gün davam edən konfransın yekun iclasında bölmə rəhbərlərinin məlumatları dinlənilib, aidiyyətli təşkilatlara müraciətlər qəbul olunub və fərqlənmə sertifikatları təqdim edilib.

**Mənsur İbrahimli**

# ADPU-da ali məktəb tələbələrinin ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi keçirilib

Xalqımızın dahi oğlu, müstəqil Azərbaycan dövlətinin banisi və qurucusu, ümummilli liderimiz Heydər Əliyev yüksək milli-mənəvi dəyərlərimizin qorunmasında, onların dövlətçiliyimizin ayrılmaz tərkib hissəsinə və bu dəyərlərin təbliğ edilməsinin dövlət siyasətinin əsas istiqamətlərindən birinə çevrilməsində böyük rol oynamışdır. Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin birgə müvafiq qərarı əsasında hazırda ulu öndər Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə respublikamızın ali məktəb tələbələri arasında bədii yaradıcılıq festivalı keçirilir. Bu bədii yaradıcılıq festivalının keçirilməsində əsas məqsəd tələbə-gəncləri milli vətənpərvərlik, adət-ənənələrimizə, mədəniyyətimizə, incəsənətimizə hörmət ruhunda tərbiyə etmək, onların bədii-estetik səviyyəsini yüksəltmək, mədəni həyat tərzinin formalaşdırılması işinə kömək etmək, həmçinin incəsənət və mədəniyyətimizin ayrı-ayrı sahələri üzrə istedadlı gənclərin üzə çıxarılaraq onların qabiliyyətlərinin inkişaf etdirilməsinə dəstək verməkdir. Festivalın keçirilməsi üçün 6 nəfərdən ibarət Təşkilat Komitəsi və tərkibinə xalqımızın tanınmış incəsənət və mədəniyyət xadimlərinin daxil edildiyi 6 nəfərdən ibarət Münsiflər Heyəti yaradılmışdır.





Mart ayından başlayaraq keçirilən festivalda ölkəmizin bütün dövlət və qeyri-dövlət ali məktəblərinin tələbələri iştirak edirlər. Qeyd edək ki, aprel ayının 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) adıçəkilən bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi keçirilmişdir. Baxış-müsabiqəsində ADPU-nun, Azərbaycan Müəllimlər İnstitutunun, Bakı Ali Neft Məktəbinin, Azərbaycan Əmək və Sosial Münasibətlər Akademiyasının təxminən 120-dən çox tələbəsi iştirak etmişdir. Baxış-müsabiqəsində ADPU-nun tələbələri yüksək səviyyəli çıxışları ilə diqqəti cəlb etmişlər. Onu da qeyd edək ki, festival qaliblərinin yekun konsertinin bu il may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur. Qaliblər Təhsil Nazirliyinin və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin diplom və hədiyyələri ilə təltif ediləcəklər.

**"Gənc müəllim"**

# Ulu öndər Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş elmi əsərlərinin təqdimatı

Aprel ayının 6-da xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji fakültəsinin Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının professor-müəllim heyətinin son illər çap edilmiş elmi əsərlərinin təqdimatı keçirilib. Təqdimat mərasimində ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev, Pedaqoji fakültənin professor-müəllimləri və tələbə-gəncləri iştirak ediblər. Tədbirdə Pedaqoji fakültənin Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının professor-müəllim heyətinin son illər çap edilmiş təxminən 30-a qədər dərslik və dərs vəsaiti, monoqrafiyaları, həmçinin ümumtəhsil məktəblərinin 1-ci, 2-ci və 3-cü sinif şagirdləri üçün hazırladıqları dərsliklər təqdim olunub.



Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, pedaqogika üzrə elmlər doktoru, professor Jalə Qədimova təqdimat mərasimində çıxış edərək bildirib ki, başçılıq etdiyi kafedra tərəfindən təqdim olunmuş bu dərsliklər Azərbaycanın musiqi elminin inkişafına müsbət təsir edəcəkdir. Belə ki, bu günə kimi ali məktəblərdə musiqi elmi sahəsində əsasən Sovet alimləriniin əsərlərindən istifadə edilirdi. Mübaliğəsiz deyə bilərik ki, bu gün təqdim edilən əsərlərin respublikamızda analoqu yoxdur. Bunlara nümunə kimi etnomusiqişünaslıq, solfecio, vokal və onun tədrisi metodikası, musiqi və onun tədrisi metodikası,musiqi əsərlərinin təhlili və musiqi tarixi ilə bağlı əsərləri qeyd etmək olar. Eyni zamanda Azərbaycanda musiqi tərbiyəsi və tədrisinin yaranması və inkişafı sahəsində musiqi pedaqogikası üzrə yazılmış "Musiqi pedaqogikası: tarixilik və müasirlik" adlı dərs vəsaitini xüsusilə qeyd etmək yerinə düşər.

Professor J.Qədimova həmçinin kafedranın fəaliyyəti haqqında ətraflı məlumat verərək bildirib ki, kafedrada keçirilən elmi seminarlar jurnal halında çap olunur. Artıq həmin jurnallar ali təhsil müəssisələrinin rəhbərliyinə təqdim edilib. Qeyd edib ki, musiqi sahəsi ilə bağlı yazılmış dərsliklər və dərs vəsaitləri Bakı Musiqi Akademiyasına, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinə, Azərbaycan Milli Konservatoriyasına, Naxçıvan Dövlət Universitetinə, Lənkəran Dövlət Universitetinə, Bakı Humanitar Kollecinə, Sumqayıt Pedaqoji Kollecinə həmin ali və orta ixtisas təhsili müəssisələrinin rəhbərlərinin müvafiq məktubları əsasında göndərilib. Qeyd edək ki, professor J.Qədimovanın təşəbbüsü ilə ADPU-da ali təhsilin magistratura pilləsində "Musiqişünaslıq" ixtisası açılıb. Bunlarla yanaşı, son illər kafedranın professor-müəllimləri pedaqoji təcrübə zamanı xüsusilə fərqləndikləri üçün müxtəlif ümumtəhsil müəssisələrindən ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun adına təşəkkür məktubları daxil olub.

ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev təqdimat mərasimində çıxış edərək Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının və bütövlükdə Pedaqoji fakültənin professor-müəllim heyətinin son zamanlar ərsəyə gətirdikləri elmi əsərlərin həm kəmiyyət, həm də keyfiyyət baxımından yüksək səviyyədə olduğunu vurğulayıb. Son illər kafedrada aparılan elmi-tədqiqat işləri təqdirəlayiqdir. Professor V.Əliyev eyni zamanda kafedranın müdiri, professor J.Qədimovanın ölkəmizin ictimai-siyasi və mədəni həyatında fəal iştirak etdiyini, Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk partiya təşkilatının üzvü və Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) ADPU Bölməsinin sədri kimi bu müsbət fəaliyyətinə görə dəfələrlə təşəkkürnamələrə və digər mükafatlara layiq görüldüyünü qeyd edib. O, həm də bugünkü təqdimata görə kafedranın müdiri, professor J.Qədimovaya və fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmova öz təşəkkürünü bildirib.

Tədbirdə çıxış edən Pedaqoji fakültənin dekanı, professor F.Rüstəmov bugünkü təqdimatın gözəl və yaddaqalan olduğunu bildirməklə yanaşı, professor J.Qədimovaya öz minnətdarlığını bildirib və kafedranın əməkdaşlarına uğurlar arzulayıb.

**Mətbuat və informasiya şöbəsi**

*Nəriman Nərimanov - 145*

# Vətənə, xalqa məhəbbət

**Xalqımızın çoxəsrlik tarixində elə böyük şəxsiyyətlər var ki, onlar zamanlara sığmır, təkcə ürəklərdə deyil, millətin ictimai-siyasi, mənəvi tarixində əbədi yaşayırlar. Belə şəxsiyyətlərdən biri də böyük ədib, görkəmli dövlət xadimi Nəriman Nərimanovdur.**

Bu gün Nəriman Nərimanovun adı, onun xatirəsi məmləkətimizin hər bir guşəsində anılır. Onun adını daşıyan küçələr, rayonlar ali məktəblər var, heykəli Bakının ən görümlü yerində ucaldılıb. Təkcə Azərbaycanda deyil, ölkəmizin hüdudlarından kənarda da Nərimanova böyük ehtiram və rəğbətin ifadəsini görürük.

Bolşevizm, kommunist ideologiyası bu gün haqlı olaraq tənqid edilir, bir vaxtlar adına təriflər yağdırılan şəxsiyyətlərin heykəlləri uçurdulur, onların gördükləri işlərin, həyata keçirdiyi əməllərin xalqa, millətə nə qədər acınacaqlı tale yaşatdığı haqqında söhbətlər gedir, əsl həqiqətlər açıqlanır. Nəriman Nərimanov da Azərbaycanda kommunist ideologiyasının daşıyıcılarından biri idi, marksizm-leninizm təlimini qəbul etmişdi, aprelin 28-də ilk müstəqil dövlətimizin süqutundan sonra Azərbaycan İnqilab Komitəsinin, sonra isə Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri seçilmişdi. Daha sonra SSRİ Mərkəzi İcraiyyə Komitsəinin sədrlərindən biri olmuşdu. Bəs onda niyə kommunist Nərimanovun xatirəsi bu qədər əziz tutulur

Əlbəttə, bu suala cavab vermək heç bir çətinlik törətmir. Şəxsiyyətin hansı partiyaya, hansı dünyagörüşə yiyələnməsindən asılı olmayaraq, onun xalqa, Vətənə, mənsub olduğu millətə nə dərəcədə xidmət etməsi ilk meyardır. Nərimanovun bütün həyat və fəaliyyəti Azərbaycana, onun azadlığına, xoşbəxt həyat idealına həsr olunmuşdu. Sadəcə olaraq, o, bu idealın həyata keçirilməsini Kommunist partiyasının, bolşevizmin qələbəsində, xalqlara nicat və səadət bəxş edə biləcəyində axtarırdı. Amma çox keçmədən yanıldığını hiss elədi. Qırmızı terrorun, insanları günahsız yerə təqiblərin, ermənilərin və rusların hakimiyyətdə üstün mövqe qazanmasının şahidi oldu. Nərimanov Azərbaycanda rəhbər olduğu müddətdə bir çox zorakılıqların, tanınmış ziyalılara qarşı təqiblərin, ölkədə yaranan xaosun, hərc-mərcliyin qarşısını almağa çalışırdı və çox zaman buna nail olurdu, hətta bu xüsusda Leninə, Stalinə də məktublar yazırdı, vəziyyəti izah edirdi və görünür, SSRİ rəhbərlərinə bu xoş gəlmirdi. Və bu səbəbdən onun Azərbaycanda qalmasını mümkün hesab etməyib, guya vəzifəcə irəli çəkdilər və N.Nərimanov Moskvada anladı ki, onun kommunist ideologiyasına bəslədiyi inam sarsılır. Nərimanovun ölümü də müəmmalı oldu. Ölümündən bir il sonra Moskvada onun yubileyini keçirdilər, amma Azərbaycanda bu yubiley keçirilmədi, çünki bolşevik-erməni diasporu, həmçinin Nərimanovu sevməyən azərbaycanlı kommunistlər bunu istəmirdilər.

Beləliklə, faciəli bir ömür sona yetdi. Doğrudur, Nərimanov unudulmadı, xalqın xatirəsində yaşadı, amma geniş təbliğ olunmadı, hətta üstündən "millətçilik" damğası da əskilmədi. Yalnız sular durulanda, Stalinin şəxsiyyətin pərəstiş kultu aradan qaldırıldıqdan sonra Nəriman Nərimanovun həyat və fəaliyyəti gündəmə gəldi. Ulu öndər Heydər Əliyevin böyük səyi və təşəbbüsü ilə Nərimanovun irsi geniş təbliğ olundu, Bakıda əzəmətli heykəli ucaldıldı, onunla bağlı yasaqlar aradan götürüldü.

Nəriman Nərimanovdan, onun bir şəxsiyyət kimi böyüklüyündən və ümumən xalqa xidmətlərindən söz açanda doğrudan da heyrətə gəlirsən. Fikirləşirsən ki, 54 illik qısa bir ömürdə bir insan bu qədər işləri necə həyata keçirə bilər? Təbii ki, bütün bunları, onun millət yolunda, xalq yolunda gördüyü işləri bütünlüklə sadalamaq, bu haqda geniş söz açmaq bir yazının işi deyil. Odur ki, bu yazıda ədibin maarifçilik və bədii yaradıcılığından söz açacağıq.

Nəriman Nərimanov Azərbaycan ziyalılarının yetişməsində böyük rol oynayan Qori Müəllimlər Seminariyasını bitirmişdi. Onun ilk əmək fəaliyyəti də müəllimliklə başlanmış, Tiflis quberniyasının Qızılhacılı kəndində müəllimlik etmişdi. Az sonra o, Bakıya gəlir və burada da pedaqoji fəaliyyətini davam etdirir. Ancaq onun müəllimliyi təkcə dərslərlə, sinif otaqları ilə məhdudlaşmır, Nərimanovu Azərbaycan maarifinin işini canlandırmaq, ana dilində dərsliklər tərtib etmək, bu sahədə islahatlar aparmaq düşündürürdü. Onun Azərbaycan dili qrammatikası, ruslar üçün Azərbaycan dili və azərbaycanlılar üçün rus dili dərslikləri müəllimlərə, tələbələrə hava-su kimi lazım idi.

O, ana dilinin fəal təbliğatçılarından biri idi və öz əsərlərində də bu dilin zənginliklərini, gözəllik və məlahətini üzə çıxarırdı. Məqalələrinin birində yazmışdı: "Ana dili! Nə qədər rəfiq, nə qədər ali, hissiyyati-qəlbiyyə oyandıran bir kəlmə! Nə qədər möhtərəm. Müqəddəs, nə qədər əzəmətli bir qüvvə! Ana dili! Bir dil ki, mehriban bir vücud öz məhəbbətini, şəfqəti-madəranəsini sənə o dildə bəyan edibdir. Bir dil ki, sən daha beşikdə ikən bir layla şəklində öz ahəng və lətafətini sənə eşitdirib ruhun ən dərin guşələrində nəqş bağlayıbdır! Bir dil ki, həyat və kainat haqqında ilk əvvəl dil sayəsində bir fikir hasil edibsən, cism və ruhun möhtac olduğu məvadi o dildə tələb eləyibsən... Haman dil ki, diyari-qürbətdə... onu eşidəndə ürəyin döyünməyə, üzün gülməyə başlayır beynin, fikrin, xəyalın işləməyə başlayır, bir dəqiqənin ərzində Vətəni gözünün qabağına gətirirsən..." Nərimanov digər məqaləsində yazmışdı: "Bir millət özünü tanımayınca hüququnu düşünməz. Tanımaq üçün də milli dil, milli məktəb, milli mətbuat, milli ədəbiyyat lazımdır. Bunların da meydana gəlməsi və tərəqqisi bizim üçün hürriyyətə bağlıdır".

N.Nərimanov 1894-cü ildə Bakıda ilk xalq qiraətxanası açır. Məqsəd nə idi? O idi ki, cavan ziyalılar, tələbələr yeni əsərlərlə tanış olsunlar, ana dillərini sevsinlər, mədəniyyət və maarif yolunda faydalı işlər görsünlər. Burada yoxsul şagirdlərin və tələbələrin xeyrinə teatr tamaşaları da təşkil edilirdi. O, anadilli mətbuatın da çiçəklənməsini, bu yolla xalqı maarifləndirməsini arzulayırdı, hərçənd ki, keçən əsrin əvvəllərində bir çox qəzetlər, jurnallar nəşr olunurdu. Amma Nərimanov istəyirdi ki, "Təzə xəbərlər" adlı bir qəzet nəşr olunsun, məmləkətdə və dünyada baş verən hadisələrdən, ictimai-siyasi olaylardan xəbər tutsunlar. O istəyirdi ki, uşaqlar və məktəblilər üçün "Sovqat" və "Məktəb" adlı sırf pedaqoji xarakterli jurnallar çap olunsun, bu barədə müvafiq təşkilatlara müraciət də etmişdi, amma onun xahişləri müxtəlif bəhanələrlə rədd edilmişdi.

Nərimanov Azərbaycan teatrının qızğın təbliğatçılarından olmuşdur. Görkəmli ədib Mir Cəlal Paşayev yazırdı ki, o, aktyor dəstələri ilə yaxından əlaqə saxlayır, onların Bakıda verdiyi tamaşalara rəhbərlik edir, bu dəstə ilə birlikdə bəzən Azərbaycan qəzalarına da gedirdi. Bu səfər zamanı o, tamaşalar verməklə yanaşı, məruzələr edir, dinləyicilərin diqqətini dövrün bəzi mühüm hadisələrinə, maarif və mədəniyyət məsələlərinə cəlb etməyə çalışırdı. O, Gəncədə yeni tikilən məktəbin xeyrinə verilmiş teatr tamaşası münasibətilə məruzə etmiş və həmin məruzəni 1899-cu ildə ayrıca kitabça halında nəşr etdirmişdi. Onun teatrla, ayrı-ayrı tamaşalarla bağlı maraqlı fikirləri var. Məsələn, Cəlil Məmmədquluzadənin 1916-cı ildə tamaşaya qoyulmuş "Ölülər" komediyası haqqında yazmışdı: "Artıq dərəcədə məharətlə yazılmış, məzmunu eynən həyatımızdan götürülmüş, paslanmış beyinləri pasdan təmizləyib, ölmüş ruhlara can verəcəkdir".

Yeri gəlmişkən qeyd edək ki, Nərimanov işinin çoxluğuna (o, Odessada Tibb Universitetini bitirmiş və Qaraşəhərdə həkim işləyirdi, müxtəlif mövzularda məqalələr yazırdı, inqilabi fəaliyyətlə məşğul olurdu və s.) baxmayaraq, əsrin əvvəllərində Azərbaycan ədəbi prosesində fəal iştirak edirdi. O, bir tənqidçi-ədəbiyyatşünas kimi də öyrənilməyə, tədqiq olunmağa layiqdir və nə yaxşı ki, mərhum akademik Kamal Talıbzadə "XX əsr Azərbaycan tənqidi" monoqrafiyasında bu xüsusda maraqlı faktlarla bizi tanış edir. Məlum olur ki, "Nərimanov "Fikir" adlı ayrıca tənqid jurnalı nəşr etmək istəmiş, bu münasibətlə Bakı şəhər polisinə müraciət etmişdi, məqsədi bu idi ki, dövri mətbuatın xülasəsi, müasir yazıçıların əsərlərinin xülasəsi verilsin. Nərimanov "Nicat" maarif cəmiyyətində ədəbiyyat şöbəsinin sədri olduğu zaman "Tənqid gecələri" adı altında dərnək yaratmışdı. A.Şaiqin yazdığına görə, "burada təşkil olunmuş tənqid dərnəyində ayrı-ayrı əsərlər haqqında yazılmış tənqidlər oxunub müzakirə edilirdi".

Nərimanovun ən çox sevdiyi sənətkarlardan biri və bəlkə də birincisi - Mirzə Ələkbər Sabir olmuşdur. O, "Hümmət" qəzetində Sabirə həsr olunan məqalə dərc etdirmiş və Sabiri "fəhlə-kəndli şairi" adlandırmışdı. Yazmışdı ki, Sabir fəhlə və kəndli sinfinin ağa və mülkədar zülmü altında çəkdiyi məşəqqətləri əyani və canlı şəkildə göstərən şairdir. Azərbaycan Sovet Respublikasına rəhbərlik etdiyi ilk illərdə Bakıda Sabirə heykəl qoyuldu və əlbəttə, bu, Nərimanovun təşəbbüsü ilə olmuşdu.

Nərimanov ədəbi mövqeyinə görə realist Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən biridir və bu mənada onun Həsənbəy Zərdabi, Cəlil Məmmədquluzadə, Sabir, Üzeyir bəy Hacıbəyli kimi sənətkarlarla bir sırada öyrənilməsi, tədqiq olunması tamamilə təbiidir. Mir Cəlal Paşayevin ifadəsiylə desək, "Nəriman Nərimanov əlinə qələm aldığı gündən etibarən gördüklərini, düşündüklərini yazmaq, bu yazıları ilə də tərəqqiyə xidmət etmək istəyirdi".

O, ədəbi yaradıcılığa "Nadanlıq" pyesini yazmaqla başlamışdı. Bu pyes 1895-ci ildə, Bakıda tamaşaya qoyulmuşdu. Nərimanovu bir maarifçi-realist ədib kimi düşündürən məsələlərdən biri də nadanlıqla mübarizə idi. Pyesdə bir kəndin və bir ailənin timsalında nadanlığın (bisavadlığın, elmsizliyin, oğurluğun, quldurluğun və s.) necə dəhşətli bəlalar törətdiyi kəskin tənqid hədəfinə çevrilir. Nərimanov pyesdə təsvir olunan hadisələri kənddə müəllim işləyərkən öz gözləri ilə görmüşdü. Cəhalətin, irticanın, köhnəliyin maarif, tərəqqi və yeniliklə mübarizəsi hələlik birincilərin qələbəsi ilə bitir, elmə, təhsilə meyilli olan Öməri bir kimsə yox, quldur qardaşı Vəli qətlə yetirir və son anda Ömərin dilindən bu sözlər qopur: "...məni nadanlıq... avamlıq... bimərifətlik... güllələdi! Ah, nadanlıq!"

Sonra "Dilin bəlası, yaxud Şamdan bəy" komediyası yazılır. Bu pyesdə nadanlığın başqa bir bəlası - mülkədar ailələrindəki mənəvi boşluq, xəyanət, pula hərislik ifşa olunur. Şamdan bəy saf bir məhəbbətə - Yusiflə Xədicənin sevgisinə mane olmaq istəyir, amma sonda onun fırıldaqlarının üstü açılır və ifşa olunduğunu bilib, intihar edir. Komediyada, adətən, ölüm hadisələri olmur, amma burada ölüm heç kimi təəssüfləndirmir, çünki ölən adam rəzil və xaindir, dosta etibarsız çıxıb.

N. Nərimanov Azərbaycan ədəbiyyatında ilk tarixi faciənin, ümumiyyətlə, ilk tarixi dram əsərinin müəllifidir. "Nadir şah" faciəsi ilə böyük ədib, Yaşar Qarayevin ifadəsi ilə desək, "çox geniş yayılmış bir üsuldan istifadə etmiş, müasir mövzunu tarixi keçmişə atıb, çox həqiqətləri öz müasirlərinə başa salmışdır". Nərimanov bu əsərdə özündən heç bir şey uydurmamışdır, tarixi sənədlərə müraciət etmiş, Nadir şahın faciəsini ön plana çəkmişdir. Və belə bir həqiqəti sübut etmişdir ki, istibdad hökm sürən bir quruluşda ədalətli şah ola bilməz. Nadir şah dərəbəyliyə son qoymaq, ölkədə qanun-qayda yaratmaq, vətən və xalq mənafeyini əsas tutmaq, dini dövlətdən ayırmaq istəyirdi. Lakin onun ətrafı Nadir şahın bu islahatlarına qarşı çıxır, gizlində ona tor qururlar. Nadir şah düşmən hiyləsinə uyub oğlunun gözlərini çıxarır, beləliklə, əsərdə faciəvi məqamlar şiddətlənir, millət və vətən yolunda qılınc çalan Nadir şah düşmən hiyləsinə məğlub olur.

Nəriman Nərimanov Azərbaycan ədəbiyyatında ilk roman müəlliflərindən biri kimi tanınır. Keçən əsrin sonlarında Zeynalabdin Marağalının fars dilində qələmə aldığı "İbrahimbəyin səyahətnaməsi" romanından sonra bu janra maraq artdı, "kiçik romanlar" yazıldı. Təbii ki, indiki meyarla yanaşsaq, həmin romanlar həcmcə janrın ölçüsünə uyğun gəlmir, amma bu da bir mərhələ idi, oxucuları roman deyilən bir ədəbi formaya alışdırmaq idi. Nərimanovun "Bahadır və Sona" romanı da bu qəbildən idi. Əsərdə türk oğlu Bahadırın erməni qızı Sonaya aşiq olması, lakin "uçurum dərələr"in, milli ayrı-seçkiliyin mövcud olması bu məhəbbətin qarşısında sədd çəkir. Ermənilərin məkrli hərəkətlərini N. Nərimanov sonralar - Azərbaycanda rəhbər vəzifədə işləyərkən bir daha hiss edəcəkdi.

Zaman keçdikcə Nəriman Nərimanovu biz daha fəhmlə dərk etməyə başlayırıq. Onun böyüklüyünü dərk edirik. Faciəsini anlayırıq. Və XX əsri Nərimanovsuz təsəvvür edə bilmirik. Vətənə, xalqa məhəbbətlə yoğrulan Nəriman Nərimanov ömrü bütün nəsillər üçün örnəkdir.

**Vaqif YUSİFLİ,**
**filologiya üzrə elmlər doktoru**

*"Azərbaycan" qəzeti, 12 aprel 2015-ci il*

# İnsanlara nur bəxş edən şəxsiyyət

**İşıq bizim düşüncəmizdə köklü anlayışlardan biridir. İlk növbədə qaranlığın, zülmətin, fəna və heçliyin qənimidir. Həyatın, diriliyin, əbədiyyət və uğurun rəmzidir. Dilimizdə "işıqlığa çıxasan", "aydınlıq olsun" diləkləri ən ucalardandır. Bunun bir kökü Vətənimizdə qədim tarixi olan atəşpərəstliyə, o biri isə ana təbiətin özünə əsaslanır. Yəqin atəşpərəstlik də ana təbiətdən gəlir. Elektrik işığı, heç şamın və çırağın özü də həmişə olmayıb axı. Yəqin elə o vaxtlardan insanlar işığı - günəşi səhərədək səbirsizliklə gözləyiblər, gecələr isə ay çıxanda seviniblər. İşıq, atəş - xilaskar və uca sayılıb, onlara sitayiş də yəqin ki, bu diləklərdən yaranıb.**

Müqəddəs Quranda Rəbbimiz tərəfindən "Sizə Quranı bir nur endirdik" ayəsi buyurulub. Yəni işıq və aydınlıq Tanrıdandır, sələmətliyin və sülhün bir rəmzidir, müsəlmanın əsas dəyərlərindəndir. Bu dəyərlər yarananda çox-çox sonralar, XIX əsrin ortalarında daha bir xilaskarlıq anlayışı yarandı: göz həkimi! Yəni peşəsinə görə işıq və nur bəxş edən insan. Vətənimizdə ilk belə insanlardan biri akademik Zərifə Əliyeva olub.

Artıq biz firavan ölkədə yaşayırıq. Akademik Zərifə Əliyevanın xalqımız qarşısında xidmətlərini görmək üçün keçən əsrin 20-30-cu illərinə qayıtmalıyıq, göz xəstəliklərinin müalicəsinin ölkəmiz üçün çətin bir problem olduğunu təsəvvür edə bilməliyik. Hələ inqilabdan əvvəl Azərbaycanın şoran ərazilərində, Kürqırağı məntəqələrdə, küləyin güclü olduğu yerlərdə göz xəstəlikləri kütləvi hal almışdı. Dörd il davam edən Böyük Vətən müharibəsinin yaratdığı problemlərdən də biri 1950-ci illərdə ölkəni bürüyən traxoma epidemiyası oldu. Bu xəstəlik insanlara təkcə əziyyət vermirdi, simaları eybəcərləşdirirdi, bəzən də ailənin iki-üç üzvünü dünya işığına həsrət qoyurdu. Traxoma bütün üsullarla başqalarına keçən infeksion bəla idi, hətta milçəklər vasitəsilə də yayılırdı. Tropik iqlimli ölkələrdə yayılan bu xəstəlik bataqlıq zonalarda, Kür və Arazın hər il daşdığı və bataqlıqlar yaratdığı yerlərdə epidemiya kimi yayılırdı. Hazırda dünyada 70-80 milyon traxoma xəstəsinin olduğu deyilir.

1950-ci illərdə bu qorxulu infeksiyanın qarşısını Zərifə Əliyevanın fəal iştirak etdiyi həkimlər briqadası aldı. Onlar infeksiyanın ən kütləvi xarakter aldığı yerlərə gedir, öz sağlamlıqlarını riskə qoyaraq insanları traxoma bəlasından xilas etməyə çalışırdılar. Nəhayət, dörd-beş ildə buna nail oldular...

Zərifə xanımın fədakar həyat yolu uzaq və sakit Şahtaxtı kəndindən başlamışdı. Bu, Şərur rayonunun ən qədim obalarından biridir. Atası Əziz Əliyev dədə-baba yurdu olan İrəvandan Naxçıvana könüllü köçməmişdi. Ermənilərin şovinizmi və vəhşiliyi son həddə çatanda 1918-ci il hadisələri, ermənilərin hər yerdə müsəlmanları qəddarlıqla məhv etməsi o zaman Peterburqda Hərbi-Tibbi Akademiyada oxuyan Əziz Əliyevi laqeyd qoya bilməzdi. O, İrəvana qayıtdı, vəziyyətin çox ciddi və dözülməz olduğunu görüb ailəsini Şahtaxtıya köçürdü. Burada onların uzaq qohumları yaşayırdı.

Erməni basqınları ilə əlaqədar ikinci kursdan sonra təhsilini yarımçıq qoyan Əziz Əliyev onu nəyin bahasına olursa-olsun davam etdirmək əzmində idi. Bakıda 1919-cu ildə açılmış universitetin tibb fakültəsində təhsil almaq qərarına gəldi. Nəhayət, 1923-cü ilin mayında ailə həmişəlik Bakıya köçdü. Əziz Əliyev universiteti bitirdikdən sonra aspiranturaya da girdi, namizədlik dissertasiyası da müdafiə etdi. O, təhsili və elmi sevirdi, bunlara güvənirdi. Təsadüfi deyil ki, İrəvan Gimnaziyasını qızıl medalla bitirmişdi. Bakıdakı mədəni inqilab mühiti, savad kultu onun arzularının reallaşmasına geniş imkanlar açdı. Artıq 1932-ci ildə Əziz Əliyev Azərbaycan səhiyyə komissarının müavini vəzifəsini icra edirdi.

Əziz Əliyev sonralar Azərbaycanda yeni tibbi xidmətin təşkilatçılarından biri oldu. "Ot kökü üstə bitər" - deyiblər. Atası Bakıya gələndən sonra Zərifənin həyatı da həmişəlik bu şəhərlə, burada reallaşdırılan tibbi layihələr və işlərlə bağlandı. Atası Əziz Əliyev 1935-ci ildə Azərbaycan Tibb İnstitutunun rektoru təyin olunanda Zərifənin on üç yaşı vardı. Amma o, gözünü açandan evlərində insan sağlamlığı, həkimin xalqa xidməti barədə çox söhbətlər eşitmişdi. 1939-cu ildə Əziz Əliyev Azərbaycanın səhiyyə komissarı təyin olundu. Görünür, tale özü Zərifə xanımı həkim olmağa hazırlayırdı.

Atalarının həkim və böyük səhiyyə təşkilatçısı olması, ailədəki nüfuzu övladlarının peşə seçimində mühüm rol oynadı. Qardaşları Tamerlan və Cəmil də həkim oldular. Zərifə xanımın böyük qardaşı Tamerlan Əliyev (1921-1997) respublikamızın ən yaxşı endokrinoloqlarından biri idi. Atasının yoluna sadiq qaldı, əməkdar elm xadimi, Dövlət mükafatı laureatı, tibb elmləri doktoru, professor kimi adlar aldı. Görkəmli alim 250-dən çox elmi əsərin, 12 monoqrafiyanın, dərslik və dərs vəsaitlərinin müəllifi idi.

Zərifə xanımın kiçik qardaşı Cəmil Əliyev isə tibbin ən çətin sahəsini - onkologiyanı seçdi, bu sahədə elmi avtoritetə çevrildi. O, tibb elmləri doktoru, professordur, 2001-ci ildən Milli Elmlər Akademiyasının həqiqi üzvüdür. Cəmil Əliyev həmçinin Nyu York Elmlər Akademiyasının üzvü, Rusiya Tibb Elmləri Akademiyasının həqiqi üzvü, Rusiya Federasiyasının Təbiət Elmləri Akademiyasının həqiqi üzvü, İngiltərə Nammersmit Kral Universitetinin professoru, Anderson xərçəng əleyhinə Mərkəzin professorudur. Görkəmli alimin 230-dan çox elmi əsəri çapdan çıxıb. 80-nə yaxın elmi əsəri xaricdə çap olunub. Uzun illərdir respublika Milli Onkologiya Mərkəzinə rəhbərlik edir.

İnsanlara nur və sağlamlıq vermək həkim sülaləsinə çevrilən bu ailənin tale yolu oldu.

İnsan xarakterinin öz məntiqi də var: ailənin təsiri, dəyərləri bizim taleyimizdə mühüm məsələdir. Hər birimizin varlığında adsız bir özək var və bu özək bizimlə bir doğulur. Zərifə xanımın da daxilindəki bu özək çox möhkəm idi. Ailələrinin, atasının cəmiyyətdəki mövqeyi yüksək olduğu kimi, o da məktəb illərindən müstəqil şəxsiyyət kimi düşünür və öz gələcək həyatına ciddi yanaşırdı. Axı ailə insanın sosial statusunu həmişəlik müəyyən etmir. Həyatın bəzən amansız sınaqlarında hər kəs öz iradə qüvvəsindən istifadə etməli olur. Zərifə xanım da gəncliyindən öz şəxsiyyətinin, zəhmətinin ən yaxşı keyfiyyətlərinə əsaslanmağa çalışırdı. Digər tərəfdən, atasının nümunəsi, az qala əsgər həyatı yaşaması onun gözünün qarşısında idi. Onların zamanı belə idi: güzəştsiz, tələbkar, hədsiz məsuliyyət tələb edən bir zəmanə.

Zərifə orta məktəbi bitirəndə 1942-ci il idi. Sovet-alman cəbhəsində sovet ordusu dalbadal uğursuzluqlara düçar olurdu. Atası da daim əsgər şinelində idi, evdə onun üzünə həsrət idilər. Dövlət onu hara yollayırdısa gedirdi, əlindən gələni əsirgəmirdi. Zərifə də zamana, atasına layıq olmalı idi. Ağır və mürəkkəb bir dövrdə də orta məktəbi uğurla başa vurdu, maksimum bilik toplamağa can atdı. Nəticə də onun zəhmətinə görə oldu: 1942-ci ilin yayında imtahanları uğurla verib Azərbaycan Tibb İnstitutunun müalicə fakültəsinə daxil oldu.

Müharibə də ağır bir sınaq idi: acıları, amansız qayda və tələbləri ilə. Bunların hamısına dözmək lazım idi, stalinizmin total nəzarətinə də həmçinin. Belə şəraitdə büdrəmək, gileylənmək olmazdı, bəlkə də nümunə olmaq lazım idi. Onları böyüdən anaları Leyla xanım bunu həmişə deyirdi. Müdrik, zəhmətkeş, əsl xalq adamı olan anaları hər şeyi nəzarətdə saxlayırdı.

Zərifə və bacısı Gülarə həm də musiqi təhsili almışdılar. Bu maraq onlara atalarından keçmişdi. Ədəbiyyat və musiqi sənətinin görkəmli simaları tez-tez onların evlərində olurdular. Zərifə xanım gözünü açıb evlərində Üzeyir bəy Hacıbəyli, Müslüm Maqomayev, Mirəsədulla Mirqasımov, Səməd Vurğun, Bülbül kimi böyük şəxsiyyətləri görmüşdü. Onların sözü, söhbəti həmişə yadda qalırdı. Belə ünsiyyət heç bir hafizədə izsiz qala bilməzdi və qalmadı. Bütün bunlar Zərifə Əliyevada şəxsiyyət olmaq, xalqın ümumi işi üçün nə isə etmək istəkləri yaratdı, onu maarifə və elmə bağladı.

Evdəki piano da tez-tez səslənirdi. Həyatın çətin vaxtlarında da, tələbə və məktəb yoldaşları onlara gələndə də... Zərifə xanımın kiçik bacısı Gülarə Əliyeva konservatoriyanı bitirdi, 1966-cı ildə "Dan Ulduzu" instrumental ansamblını yaratdı. Əməkdar incəsənət xadimi adına layiq görüldü, musiqi nəzəriyyəsi kafedrasının müdiri oldu. Ansambl xalq musiqisinin inkişafında və təbliğində mühüm rol oynadı.

1941-1945-ci illər müharibəsinin ən çətin günlərində bu ailənin qapısı tanış və qohumların, məktəb, sonra isə tələbə yoldaşlarının üzünə həmişə açıq idi. Taleyin və tarixin gətirdiyi qıtlığı elnən, obaynan yaşamaq daha asandı. Leyla ana da bunu bilir, ən çətin günlərdə, ən ağır xəbərlər gələndə yaxın insanlara sığınır, onlardan güc alırdı. Bu da böyük xalq dəyərinə sığınmaq idi: xalqla birgə olmaq idi.

1947-ci ildə Azərbaycan Dövlət Tibb İnstitutunu əla qiymətlərlə bitirən Zərifə Əliyeva daha artıq praktik biliklərə yiyələnmək üçün Moskvaya Mərkəzi Həkimləri Təkmilləşdirmə İnstitutuna getdi. Bu gedişin daha bir məqsədi var idi: Azərbaycanı bürümüş traxoma epidemiyası! Ölkəyə məhz bu yöndə ixtisaslı həkimlər çox lazım idi. Zərifə xanım isə ümumi müalicə fakültəsini bitirmişdi. Göz xəstəlikləri üzrə ixtisaslaşmaq üçün mütləq əlavə təhsil zəruri idi. Həm də göz viruslarının regional fərdiliyi də var idi və infeksiya ilə mübarizə həm də bu fərdiliyi fundamental şəkildə öyrənməyi tələb edirdi. Zərifə xanım məhz bunu qarşıya məqsəd qoydu.

Odur ki, yenə oxumaq və öyrənmək lazım idi, elmin zəhmət tələb edən qapısından keçmək, nur elmi olan oftalmologiyaya dərindən yiyələnmək lazım idi. Xəstəyə diaqnoz qoymaq, xəstədə inam yaratmaq üçün iki min ilə yaxın tarixi olan bu elmi dərindən öyrənmək zəruri idi. Zərifə xanım həkimliyin bu sirlərini cavan yaşından anlamışdı.

1947-ci ilin Moskvası gənc mütəxəssis üçün yeni bir aləm oldu. Bəzi problemlər Bakıdakı kimi idi, məsələn, müharibədən qalmış yoxsulluq və qıtlıq, əlillərin sayının çoxluğu. İnsanların əksəriyyəti cəbhədən gəldikləri geyimdə idilər. Çünki həm təzələri yox idi, həm də almaq üçün vəsait. Yoxsulluq hər addımda görünürdü. Amma bu, bədbinlik yaratmırdı. Müharibədən sonra insanlarda daha böyük həyat eşqi vardı. Hər yanda tikinti və bərpa işləri gedirdi. Moskva Zərifə xanım kimi gəlmələrlə dolu idi. Böyük, ucsuz-bucaqsız ölkənin hər yerindən bura təhsil almağa gəlmişdilər. Ölkədə müasir biliklərin əhəmiyyəti düzgün təyin edilmişdi. İnsanlar metroda belə, əli kitablı idilər, fürsət düşən kimi hamı kitab oxuyurdu. Ən başlıcası, insanlar arasında səmimiyyət, sabaha inam və ümid var idi. Müharibədən qalib çıxmış ölkədə belə də olmalı idi.

Zərifə xanım mərkəzdə sovet nomenklaturasını da gördü və hiss etdi. Bu təbəqəyə daxil olan məmurların balaları xüsusilə seçilirdi. Onların geyimi də, pulu da, əyləncə imkanları və dairələri vardı. Amma Zərifə xanımın qəlbinə sadə ailələrdən çıxmış gənclər daha yaxın idi. Onlarla daha tez ünsiyyət bağlayır, dostlaşır və rəfiqə olurdu. Moskvada Zərifə xanım o dövrün məşhur tibb alimləri ilə tanış oldu. Bir də göz cərrahiyyəsinin sürətli inkişafı onun nəzərindən yayınmadı. Müharibə tibbin cərrahiyyə sahəsinə böyük təkan vermişdi, ağlasığmaz əməliyyatlar həyata keçirilirdi. Professorlardan biri demişdi ki, cərrahiyyə - müharibələrdən doğmadır. Həqiqətən müharibədən sonra tibbin, xüsusilə cərrahiyyənin misilsiz inkişafı bunun əyani təsdiqi idi.

Zərifə xanım Moskvada iki il yaşadı, elmi işçi kimi püxtələşdi. Özünə elmi mühitdə çoxlu dostlar tapdı, onlara bağlandı, bəziləri ilə sonralar müştərək tədqiqatlar apardı, kitablar çap etdirdi. Belə dostların əksəriyyəti sonralar onun elmi işlərinin rəyçiləri və opponentləri oldular, onun barəsində məqalələr və səmimiyyət dolu xatirələr yazdılar. Məhz Moskvada Zərifə xanım həyatın və elmin çətin yoluna çıxdı. Bu, böyük həyat, fasiləsiz yüksəliş yolu idi.

1949-cu ildə Bakıya qayıdanda Zərifə Əliyeva artıq yüksək ixtisaslı göz həkimi idi. Onu Elmi-Tədqiqat Oftalmologiya İnstitutuna elmi işçi göndərdilər. Bu, ürəyindəki arzulara uyğun idi: göz xəstəlikləri üzrə elmi tədqiqatlar aparmaq. Azərbaycanda traxoma virusunun qarşısını al-



maq və sonra isə onun kökünü kəsmək, həm praktik, həm də fundamental araşdırmaların kəsişdiyi yerdə həyata keçə bilərdi. Ona görə Zərifə xanım aspiranturaya hazırlaşmağa başladı. Zamanı gələndə sənədlərini verib imtahanlarda iştirak etdi. 1950-ci ildə əla qiymətlərlə aspiranturaya daxil oldu. Namizədlik mövzusu kimi traxoma xəstəliyinin və epidemiyalarının müalicəsi və profilaktikası məsələlərini seçdi.

Bu, fundamental və praktik təbabətin kəsişdiyi problem idi. Onun həlli əvvəllər yazılmış kitab və araşdırmalarda yox idi. Mövzunun açarı traxomanın tüğyan etdiyi məntəqələrə epidemiya əleyhinə ekspedisiyalar idi. Belə ekspedisiyalar praktik tədbirlər kimi təşkil edilirdi. Amma Zərifə xanım onlara həm praktik həkim, həm də fundamental araşdırmalar üçün material və fakt bazası yığan tədqiqatçı kimi qoşuldu. Üstəlik bu ekspedisiyada yoluxmaq riski də, narahat çölçülük həyatı da var idi. Amma cavan tədqiqatçı bunların hamısına dözdü. Həkim yoldaşları da onun sadəliyini, səmimiyyətini görüb ona isinişdilər və həmişəlik dost oldular.

Zərifə xanım təkcə kollektiv ekspedisiyalarla kifayətlənmədi. Traxomanın geniş yayıldığı yetimxanalara, əlil evlərinə, rayonlara, Kürqırağı kəndlərə fərdi qaydada gedir, vəziyyəti öyrənir, müalicənin effektivliyini və gedişini izləməyə çalışırdı. O zaman traxomaya qarşı sintomitsin adlı antibiotikdən istifadə edirdilər. Lakin Azərbaycan arealında bu dərmanın aktivlik və passivlik xüsusiyyətləri öyrənilməmişdi. Bu məsələ isə göz virusologiyası ilə daha çox bağlı idi. Eyni virusların adətən onlarca növlərinin olması elmə məlum idi. Lakin müalicənin effektivliyi baxımından həmişə iki cəhət aydınlaşdırılır: virusların regional növlərinin öyrənilməsi və onların antibiotikə müqavimət xüsusiyyətləri. Belə köklü problemlərin araşdırılması müalicə prosesinin müxtəlif mərhələlərinin diqqətlə izlənilməsi, müalicənin fərdi xüsusiyyətlərinin elmi təsnifi lazım idi. Bu isə zəhmət, səbir, xəstələrlə fərdi iş tələb edirdi. Bütün bunlar cavan alimdə var idi: həmkarları onun müalicə prosesinin gedişini necə diqqətlə izlədiyinə heyran qalırdılar. Amma Zərifə xanım yaxşı bilirdi: zəhmətsiz heç nə olmur.

1960-cı ildə namizədlik dissertasiyasını uğurla müdafiə etdi.

Həmin il Zərifə xanım Oftalmologiya İnstitutunda baş elmi işçi vəzifəsində çalışıb, 1967-ci ilə qədər öz araşdırmalarını burada davam etdirir. Bu dövrdə artıq o, yeni problem - göz xəstəliklərinin ən çox yayılanı olan qlaukoma ilə məşğul olmağa başlayır. İnsanlarda qırx yaşından sonra başlanan bu xəstəlik erkən korluqla da nəticələnə bilir, çox hallarda isə görmə qabiliyyətini aşağı səviyyəyə salır. Zərifə xanımın bu mövzuda yazdığı məqalə və araşdırmaları həkimlərin stolüstü kitabına çevrildi.

1967-ci ildə Zərifə xanım Səhiyyə Nazirliyinin Həkimləri Təkmilləşdirmə İnstitutuna, Göz xəstəlikləri kafedrasına dosent vəzifəsinə dəvət edilir. Ailə qayğılarının qat-qat artmasına baxmayaraq, praktik həkimlik işindən uzaqlaşmır: çoxlu cərrahiyyə əməliyyatları edir, xəstələri ilə məşğul olur, onların müalicə tarixçəsini izləyirdi. Həm kurslara gələn həkimlərə oftalmologiyanın ən yeni nailiyyətləri, müalicə və cərrahiyyə üsulları barədə mühazirələr oxuyur, həm də cavan kadrlarla, tələbələri ilə iş aparırdı. Bu illərdə o daha mühüm bir problemlə - peşə ilə bağlı göz xəstəlikləri ilə məşğul olmağa başlayır. Həyatın tələbi olan bu problem minlərlə insanların görmə qabiliyyətini qorumağa yönəlmişdi. Azərbaycanda sənayenin sürətli inkişafı, istehsal sahələrinin genişlənməsi, xüsusilə kimya sənayesi bu sahələrlə bağlı göz xəstəliklərini ciddi problemə çevirmişdi.

1968-ci ildən sonrakı elmi fəaliyyətini professional göz xəstəliklərinə həsr etməsi də bununla əlaqədar idi. Sumqayıtda insanlar bütün ömürləri boyu kimyəvi maddələr istehsalı sahəsində çalışırdılar. Bu isə müəyyən xəstəliklərin yaranmasına gətirib çıxarırdı. Kimyəvi istehsal insan orqanizmi üçün ən təhlükəli iş mühitidir. Burada bir sıra digər xəstəliklər də yarana bilir. Amma göz xəstəlikləri bunların bəlkə də ən ağırı idi. Zərifə xanım bunu yaxşı dərk edir və zəhmət adamlarına kömək edən dərmanlar və müalicə üsulları yaratmağa çalışırdı. Bu məqsədlə Bakı və Sumqayıtın bəzi zavodlarında eksperimentlər keçirilirdi. Təcrübi yol kimyəvi maddələrin və zəhərlərin insanın görmə orqanına təsirini əsaslandırmaq üçün zəruri idi. Bu işlərlə bağlı tədqiqatçı tez-tez kimya müəssislərində olur, xəstələri ilə görüşür, patoloji halları izləyirdi.

Görkəmli alim çoxillik araşdırmalarını professional göz xəstəliklərinə həsr olunmuş doktorluq dissertasiyasında ümumiləşdirdi. Müdafiəsi isə 1977-ci ildə dünya oftalmologiyasının əsas mərkəzlərindən olan Moskva Göz Xəstəlikləri Elmi-Tədqiqat İnstitutunda oldu. Onun doktorluq işi məşhur alim və həkimlərin ən yüksək qiymətlərini aldı. Elə həmin ildə Zərifə xanıma tibb elmləri doktoru elmi adı verildi, Bakıdakı işində kafedranın professoru seçildi.

1979-cu ildə SSRİ miqyasında görkəmli oftalmoloq kimi tanınan alimin həyatında yeni əlamətdar hadisə baş verdi. Zərifə xanımın təşəbbüsü ilə Elmlər Akademiyasının Ə.Qarayev adına Fiziologiya İnstitutunda Azərbaycanda ilk dəfə professional göz xəstəliklərini öyrənən laboratoriya açıldı və Zərifə xanım onun rəhbəri oldu. Əslində, bu, dünya şöhrətli alimin elmi məktəbi idi. Bu dövrdə onun şin və yod istehsalında göz patologiyasına həsr olunmuş iki monoqrafiyası çıxdı və yüksək qiymətlər aldı. Alim virus mənşəli göz xəstəlikləri barədə də qiymətli əsərlər yazdı. Həmçinin göz cərrahiyyəsi, həkim etikası, gənc kadrların hazırlığı ilə bağlı problemlər onu ömrü boyu narahat edir, bu mövzularda dəyərli əsərlərin yaradılması ilə nəticələnirdi. 1983-cü ildə Zərifə xanım Əliyeva Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvü seçildi. Bu, onun elmə verdiyi töhfələrin təsdiqi idi.

Ömrü boyu insanlara nur bəxş edən böyük şəxsiyyət - Zərifə xanım Əliyeva 1985-ci ilin 15 aprelində dünyasını dəyişdi. Bu, ağır itki idi...

Ulu öndər Heydər Əliyev xatirələrində deyirdi ki, mən Zərifə xanım kimi həyat yoldaşımın olması ilə xoşbəxt idim. Bu qibtə doğuracaq bir etiraf idi! Üç böyük tarixi şəxsiyyətin həyatında izi olan Zərifə xanım ən çox ailə və övlad dəyərləri ilə yaşadı. Bir də insanlara dünya işığı verən həkim sənətini davam etdirdi, tədqiqatlar apardı. Haqqında oxuduğum sənəd və xatirələrin, məqalə və yazıların hamısında onun sadəliyi, xalq ruhuna və dəyərlərinə bağlılığı barədə heyranlıqla danışılır. Elmi mövqeyinə görə söz və nüfuz sahibi olan məsum insan həmişə öz daxili xarakterinə, tərbiyə aldığı ailədən əxz etdiyi dəyərlərə sadiq qaldı. Sevindirici haldır ki, görkəmli alimin mənəvi və irsi davamçıları onun işlərini, arzu və ideallarını uğurla davam etdirirlər.

**Nurlana ƏLIYEVA,**
**Yeni Azərbaycan Partiyası**
**İdarə Heyətinin üzvü,**
**YAP-ın Qadınlar Şurasının sədri, professor**
*"Azərbaycan" qəzeti, 28 aprel 2015-ci il*

## Səni ürəklərdə yaşadacaqdır

***Böyük alim, xeyirxah insan Zərifə xanım Əliyevanın əziz xatirəsinə***

Yaxşılıq edənlər hər vaxt anılar,
Onun məlhəmilə gözlər nur tapdı.
Dünya işığına həsrət qalanlar,
Onun əməyilə arzuya çatdı.

Həkim ana idi, həm alim ana,
Evində qayğıkeş, elinə sadiq.
O, hikmətlə dolu bir məna idi,
Dahi atasının adına layiq.

Üzündə təbəssüm, könlündə şəfqət,
Sanki xəstələrə ana, bacıydı.
Mehriban, qayğıkeş Zərifə xanım,
Həkim sənətinin böyük tacıydı.

Bu sənət yoluyla gedən cavanlar,
Sənə bənzəməyə çalışacaqdır.
Daim çiçəklənən doğma ölkəmiz,
Səni ürəklərdə yaşadacaqdır.

**Rəşad Mahmudoğlu,**
**Filologiya fakültəsinin qiyabi şöbəsinin**
**IV tədris ilinin 401-ci qrup tələbəsi**

# AMEA-nın strukturunda dəyişiklik edilib

Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) tərkibində yeni bölmələr yaradılıb. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin fərmanına əsasən, AMEA-nın tərkibində Humanitar Elmlər Bölməsi (HEB) və İctimai Elmlər Bölməsi (İEB) yaradılıb. Akademiyanın Nizamnaməsinin tələblərindən irəli gələn məsələlərin həlli, həmçinin HEB-in fəaliyyətinin təşkil edilməsi məqsədilə AMEA-nın Rəyasət Heyətinin qərarına əsasən, Nizami adına Ədəbiyyat İnstitutu, Nəsimi adına Dilçilik İnstitutu, Ziya Bünyadov adına Şərqşünaslıq İnstitutu, Memarlıq və İncəsənət İnstitutu, Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu, Folklor İnstitutu, Nizami Gəncəvi adına Milli Azərbaycan Ədəbiyyatı Muzeyi və Hüseyn Cavidin Ev Muzeyinin HEB-in tərkibinə daxil edilib, bölmənin tərkibi müəyyənləşdirilib.

AMEA-nın Rəyasət Heyəti, həmçinin İEB-in fəaliyyətinin təşkili məqsədilə bir sıra elmi-tədqiqat müəssisələrinin bu bölmənin tərkibinə daxil edilməsi haqqında qərar qəbul edib. Buraya Abasqulu ağa Bakıxanov adına Tarix İnstitutu, Arxeologiya və Etnoqrafiya İnstitutu, Fəlsəfə və Hüquq İnstitutu, İqtisadiyyat İnstitutu, İnsan Hüquqları üzrə Elmi-Tədqiqat İnstitutu, Dünya Siyasəti İnstitutu, Elm Tarixi İnstitutu, Qafqazşünaslıq İnstitutu və Milli Azərbaycan Tarixi Muzeyi daxildir. Rəyasət Heyətinin iclasında İEB-nin üzvləri də müəyyənləşdirilib. Hər iki bölmənin fəaliyyətinin təşkili ilə bağlı AMEA-nın Ümumi Yığıncağı qarşısında vəsatət qaldırılmasını təmin etmək Humanitar və İctimai Elmlər Bölməsinin akademik-katibi, akademik Teymur Kərimliyə tapşırılıb. Qərarların icrasına nəzarət AMEA-nın vitse-prezidenti, akademik İsa Həbibbəyliyə həvalə olunub. AMEA-nın Rəyasət Heyətinin digər qərarları ilə isə akademik Teymur Kərimli Humanitar Elmlər Bölməsinin, AMEA-nın müxbir üzvü Nərgiz Axundova isə İctimai Elmlər Bölməsinin akademik-katibi vəzifələrini icra edən təyin ediliblər.

**Mətbuat və informasiya şöbəsi**

# YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının İdarə Heyətinin iclası keçirilib

Aprel ayının 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası" nda Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının İdarə Heyətinin iclası



keçirilib. İclasa sədrlik edən ADPU-nun Elmi işlər üzrə prorektoru, YAP-ın Siyasi Şurasının üzvü, professor Vilayət Əliyev iclasın gündəliyində dayanan əsas məsələnin Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatından rayon təşkilatının yaxın vaxtlarda keçiriləcək X konfransına nümayəndələrin seçilməsi olduğunu bildirib. ADPU-nun Azərbaycan tarixi kafedrasının müdiri, YAP-ın Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatının sədri, professor Himalay Qasımov təşkilatda həyata keçirilən tədbirlər və qarşıda duran vəzifələr barədə məlumat verib və çıxışının sonunda konfransa seçiləcək nümayəndələrin siyahısını iclas iştirakçılarına təqdim edib. Professor V. Əliyev professor H.Qasımovun təqdim etdiyi siyahının səsə qoyulmasını təklif edib və onun bu təklifi yekdilliklə qəbul olunub.

Sonra YAP-ın Səbail rayon təşkilatının sədr müavini Muxtar Nağıyev çıxış edərək ölkədə gedən ictimai-siyasi proseslər, YAP-ın Səbail rayon təşkilatının qarşısında dayanan vəzifələr, həmçinin ADPU-nun həyata keçirdiyi tədbirlər



və eləcə də ADPU ilə partiyanın Səbail rayon təşkilatı arasında mövcud olan sıx əlaqələr barədə öz müsbət fikirlərini söyləyib. İclasın sonunda Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi ilk təşkilatından rayon təşkilatının X konfransına seçilmiş nümayəndələrin siyahısının təsdiq edilməsi barədə qərar qəbul edilib.

**Mətbuat və informasiya şöbəsi**

# ADPU-da "Azərbaycana qarşı Sumqayıt təxribatı-"Qriqoryanın işi" kitabının təqdimatı keçirilib

Aprel ayının 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik zalında istedadlı və tanınmış teleaparıcı, siyasi şərhçi, "Azərbaycan Televiziya və Radio Verilişləri" Qapalı Səhmdar Cəmiyyətinin sədr müavini, Tarix üzrə fəlsəfə doktoru, Əməkdar jurnalist



İbrahim Məmmədovun "Azərbaycana qarşı Sumqayıt təxribatı- "Qriqoryanın işi" kitabının təqdimatı keçirilib. Tarix fakültəsinin professor-müəllimlərinin və tələbə-gənclərinin iştirak etdikləri tədbiri fakültənin dekanı, professor, Əməkdar müəllim Oqtay Sultanov açaraq bildirib ki, biz bu gün xalqımız və dövlətçiliyimiz üçün mühüm ictimai-siyasi, elmi-tarixi əhəmiyyət kəsb edən bir kitabın təqdimat və müzakirəsini keçiririk. ADPU-nun Tarix fakültəsinin məzunu İbrahim Məmmədovun müəllifi olduğu "Azərbaycana qarşı Sumqayıt təxribatı- "Qriqoryanın işi" kitabı yaxın tarixi keçmişimizin, xüsusilə də, 1988-ci ilin fevral ayının 28-də baş vermiş Sumqayıt hadisələrinin obyektiv və mükəmməl öyrənilməsi baxımından böyük əhəmiyyət kəsb edir. Xüsusi qeyd edək ki, "Azərbaycana qarşı Sumqayıt təxribatı- "Qriqoryanın işi" kitabı Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin təşəbbüsü ilə yazılıb və nəşr edilib.




Azərbaycan Prezidenti cənab İlham Əliyev Sumqayıt hadisələri haqqında belə demişdir: "1988-ci ilin fevralında Sumqayıtda baş vermiş hadisələr, əslində, Azərbaycan xalqına qarşına törədilmiş təxribatdır. Ona görə də hazırda mənim göstərişimlə bu məsələ haqda cinayət işi yenilənib. İstintaqın hədəfi təxribatın təşkilatçılarını müəyyənləşdirməkdir.İstintaq hərəkətləri tam başa çatdıqdan sonra bu hadisəyə siyasi qiymət veriləcək. Azərbaycan dövləti bu cinayətin açılmasında və təşkilatçıların müəyyənləşməsində maraqlıdır və bu işdə əməkdaşlıq etmək istəyən şəxslər, təşkilatlar və dövlətlərlə əməkdaşlığa açıqdır".

Qeyd edək ki, kitabın ön sözünün müəllifi və elmi redaktoru Azərbaycan Respublikası Prezidenti Administratiyasının rəhbəri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) həqiqi üzvü hörmətli Ramiz Mehdiyevdir. Məlumat üçün onu da qeyd edək ki, bu monoqrafiya AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun Elmi Şurasının müvafiq qərarı ilə çap olunub. Kitabın 3 dildə- Azərbaycan, rus və ingilis dillərində çap edilməsi Sumqayıt hadisələri haqqında həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması baxımından mühüm əhəmiyyət kəsb edir. Kitab xalqımızın yaxın tarixində qaranlıq mərhələni təşkil edən Sumqayıt hadisələri haqqında jurnalist təhqiqatının məhsulu olmaqla yanaşı, həm də elmi xarakter daşıyır. Çünki kitab etibarlı və mükəmməl mənbələrə, zəngin faktlara əsaslanır.

Tarix fakültəsinin Azərbaycan tarixi kafedrasının professoru, Əməkdar müəllim Xəlil Köçərli "Azərbaycana qarşı Sumqayıt təxribatı-"Qriqoryanın işi" kitabı haqqında məruzə ilə çıxış edərək bildirib ki, bu gün dünyada ikili standartların mövcud olması üzündən dünyanın bir çox ölkələri qondarma "erməni soyqırımını " qəbul edirlər. Bu gün qardaş Türkiyədə dövlət səviyyəsində Çanaqqala zəfərinin 100 illiyi ilə əlaqədar mərasim keçirilir. Dövlət başçımız İlham Əliyev də həmin mərasimdə iştirak edir. Namərd, xain və hiyləgər qonşularımız olan ermənilər də qondarma "erməni soyqırımı" nın 100 illiyini keçirirlər. Məkrli ermənilər yalançı "erməni soyqırımı" ilə bağlı 26 min kitab çap etdiriblər. Əslində isə, ermənilər özləri tarix boyu azərbaycanlılara və türklərə qarşı soyqırımları, deportasiyalar həyata keçiriblər. Buna görə də onların təbliğatı nəticə etibarilə məğlubiyyətə və məhvə məhkumdur. Yüksək intellekt səviyyəsi-



nə malik olan vətənpərvər jurnalist və tədqiqatçı-alim İ.Məmmədovun bu kitabı ermənilərə və onların havadarlarına verilən tutarlı bir cavabdır. Bu kitab Sumqayıt hadisələri haqqında konkret tarixi faktlara əsaslanan sanballı elmi-tədqiqat əsəridir. Sumqayıt hadisələri erməni fitnəkarlarının və SSRİ DTK-nın Azərbaycana qarşı çox qəddarlıqla düşünülmüş təxribati, nankor ermənilərin tarixən qonşu xalqlara, ilk növbədə, Qafqazın türk-müsəlman əhalisinə qarşı həyata keçirdikləri təcavüzkarlıq siyasətinin növbəti təzahürüdür. Müəllif bu kitabı ərsəyə gətirmək üçün fədakarlıqla çalışıb və 250-dən çox elmi mənbəyə istinad edib. Onu da qeyd edək ki, hazırda kitabın erməni dilində elektron variantı da hazırlanır. Bu gün Azərbaycan bütün dünyada tolerantlıq və multikulturalizim məkanı kimi tanınır və təqdir edilir. "Azərbaycana qarşı Sumqayıt təxribatı-"Qriqoryanın işi" kitabını tələbə-gənclərin oxuyub öyrənmələri çox vacibdir. Çünki bu kitab gənclərə tarixi həqiqətləri öyrətməklə yanaşı, onların vətənpərvər ruhda tərbiyə olunmalarına müsbət təsir göstərə bilər.

Tədbirdə çıxış edən İ.Məmmədov müəllifi olduğu "Azərbaycana qarşı Sumqayıt təxribatı-"Qriqoryanın işi" kitabının təqdimat mərasiminin yüksək səviyyədə təşkil edilməsinə görə ADPU-nun rəhbərliyinə, eləcə də Tarix fakültəsinin rəhbərliyinə, professor-müəllimlərinə və tələbələrinə öz dərin təşəkkürünü bildirib. İ.Məmmədov Sumqayıt hadisələrinin tarixi-siyasi kökləri, bu hadisələr ərəfəsində SSRİ-də və Azərbaycan SSR-də mövcud olan siyasi vəziyyət, ermənilərin və onların havadarlarının Sumqayıt fitnəkarlığının mahiyyəti və məqsədləri, həmçinin Sumqayıt hadisələrinin geosiyasi nəticələri barədə tədbir iştirakçılarına ətraflı və dolğun məlumat verib. O, eyni zamanda bu kitabının ərsəyə gəlməsində vaxtilə Tarix fakültəsində ali təhsil alarkən ona dərs demiş isdedadlı və vətənpərvər müəllimlərinin xüsusi rol oynadıqlarını vurğulayıb və onlara öz minnətdarlığını ifadə edib.

Tədqimatda Tarix fakültəsinin dekan müavini, baş müəllim Habil Həsənov, Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev də iştirak ediblər.

Görüşdə tələbə-gənclərin sualları cavablandırılıb və xatirə şəkli çəkdirilib.

**Mənsur İBRAHİMLİ**

# Tələbələrin təşəbbüsü ilə #Canakkale 100 "Twitter" kampaniyası keçirilib

Aprel ayının 24-də Azərbaycan Dövlət İqtisad Universitetinin (ADİU) tələbə-gənclərinin təşəbbüsü ilə Türkiyə Respublikasının dövlət səviyyəsində rəsmi olaraq qeyd etdiyi Çanaqqala zəfərinin 100 illiyi ilə əlaqədar #Canakkale100 "Twitter" kampaniyası keçirilib. Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) təşkilati dəstəyi ilə kampaniyaya digər ali təhsil müəssisələrinin tələbələri də cəlb olunub. Ölkənin 10 ali təhsil müəssisəsindən 5 min nəfərə yaxın tələbənin cəlb olunduğu aksiyanın keçirilməsində əsas məqsəd fəal istifadə edilən "Twitter" sosial şəbəkəsi vasitəsilə 24 aprel qondarma erməni "soyqırımı" na qarşı böyük ifşa tədbirini həyata keçirmək və Çanaqqala zəfəri ilə bağlı keçirilən tədbirlərə dəstək vermək olub. "#Canakkale 100" açar sözü vasitəsilə yayımlanan statuslarda Çanaqqala zəfərinin tarixi, erməni yalanları, Azərbaycan xalqına qarşı törədilən cinayətlər barədə məlumatlar paylaşılıb. "#Canakkale100" açar sözünün bütün gün ərzində fəal saxlanılması üçün tələbələrin sosial şəbəkələrdə paylaşımı növbəli şəkildə təmin edilib. Qeyd edək ki, aksiyada Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 35 nəfər tələbəsi fəal iştirak edib.

**"Gənc müəllim"**

# “Tələbə-gənclərin tibbi-psixoloji maarifləndirilməsi” mövzusunda seminar




Aprel ayının 7-də “Sağlamlığa Dəstək və Psixoloji İnkişaf Mərkəzi”nin və “Sağlam xəbər” müstəqil tibbi-sosial qəzetinin kollektivinin təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik zalında “Tələbə-gənclərin tibbi-psixoloji maarifləndirilməsi” mövzusunda seminar keçirilib.

Seminarı ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev açaraq qonaqları və tələbələri salamlayıb, bugunkü tədbirin ciddi bir mövzuya həsr olunduğunu bildirib. Çünki insan üçün fiziki sağlamlıq həyatda böyük əhəmiyyət kəsb edir. Müdriklər “Sağlam bədəndə sağlam da ruh olar”- deyiblər.



Seminarda çıxış edən “Sağlamlığa Dəstək və Psixoloji İnkişaf Mərkəzi”nin rəhbəri və “Sağlam xəbər”müstəqil tibbi-sosial qəzetinin baş redaktoru Ramil Nəcəfli ilk olaraq tədbirin keçirilməsinə göstərdiyi köməkliyə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirib. Ramil Nəcəfli çıxışına davam edərək bildirib ki, rəhbərlik etdiyi qurum və qəzet milli genefondumuzun qorunması, həmçinin gənc nəslin vaxtında tibbi-psixoloji cəhətdən düzgün istiqamətləndirilməsi üçün ali təhsil müəssisələrində müxtəlif tədbirlər həyata keçirir. Tələbə-gənclərin fərdi inkişafı, düzgün ünsiyyət, motivasiya, onların insan tanıma bacarıqlarına yiyələnmə, imtahan stressləri, tələbələrdə rast gəlinən və təhsildə motivasiyanı aşağı salan depressiv hallar, habelə cinsi-infeksion xəstəliklərdən qorunma və düzgün müalicə yolları, düzgün həyat və düşüncə tərzi, komplekslərdən qurtulma bu tədbirlərin əsas mövzularını təşkil edir.

Müasir dövrümüzdə qadın və kişi cinsinin nümayəndələri bir-birini tanımaqda çətinlik çəkirlər. Xüsusilə də, gənclər bu baxımdan bir çox problemlərlə qarşılaşırlar. Ünsiyyət və qarşılıqlı münasibətdə gənclər müəyyən çətinliklərlə üzləşirlər. Ailə qurmaq qərarını vermiş gənclər nikahaqədər münasibətdə və eləcə də ailə qurandan sonra müxtəlif mənəvi-psixoloji uyğunsuzluqlar yaşamalı olurlar. Dünyanın bir çox ölkələrində gənclər nikaha daxil olana kimi psixoloq yanına gedərək qarşılıqlı münasibətdə onları narahat edən suallarla psixoloqa müraciət edirlər. Bu baxımdan, gənclərin tibbi-psixoloji maarifləndirilmələri mühüm əhəmiyyət kəsb edir.

Seminarda psixoloq, Xəzər Universitetinin müəllimi Təhmasib Cavadzadə, həkim, Azərbaycan Tibb Universitetinin müəllimi Ramazan Əliyev və digər mütəxəssislər çıxış edərək gənclərin nikahaqədərki münasibəti, emosional bağlılıqları, ailədəki davranışları və digər vacib məqamlarla bağlı ətraflı məlumat veriblər. Canlı müzakirə şəraitində keçən seminarda tələbə-gənclərin çoxsaylı sualları cavablandırılıb.

**Könül NƏZƏROVA**

# SABAH könüllülərinin supervayderlərinin və “Bakı-2015” Avropa Oyunları Könüllülərinin birgə təqdimat tədbiri

Aprel ayının 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) SABAH könüllülərinin supervayderlərinin və “Bakı-2015” Avropa Oyunları Könüllülərinin birgə təqdimat tədbiri keçirilib. Təqdimat tədbirində çıxış edən ADPU-nun SABAH qruplarında Riyaziyyat və informatika ixtisası üzrə təhsil alan II kurs tələbəsi, SABAH könüllülərinin supervayderi Xaləddin Məmmədov bildirib ki, SABAH qruplarının yaradılmasında əsas məqsəd ali təhsildə təhsilin keyfiyyətinin yüksəldilməsidir. SABAH qrupları Savadlı, Bacarıqlı və Hazırlıqlı tələbələrdən ibarət qruplardır. Bu qruplarda təhsil alan tələbələr yalnız təhsil almaqla kifayətlənməməli, ictimai baxımdan da fəal olmalıdırlar. Bu nöqteyi-nəzərdən SABAH qruplarında təhsil alan tələbələrin iyun ayında ölkəmizdə keçiriləcək Birinci Avropa Olimpiya Oyunlarına könüllü dəstək vermələri təqdirəlayiqdir. ADPU-nun SABAH könüllüləri mütəmadi olaraq “Gənclər Evi” ndə yığışaraq müxtəlif təkliflər, ideyalar irəli sürür, qəbul olunan təklif və ideyaları Təhsil Nazirliyinə təqdim edirlər. ADPU-nun SABAH könüllüləri aprelin 16-da 7 universitetin könüllüləri ilə birlikdə universitetdə toplantı keçirməyi, aprelin 19-da isə flaş-mob gerçəkləşdirməyi planlaşdırırlar. Universitetimizin SABAH könüllüləri vahid komanda şəklində fəaliyyət göstərirlər. Bütövlükdə isə ADPU-nun SABAH könüllüləri yalnız Birinci Avropa Olimpiya Oyunlarında deyil, eləcə də gələcəkdə dövlət səviyyəsində keçirilən bütün tədbirlərdə iştirak etməyi öz qarşılarına məqsəd qoyublar. SABAH könüllüləri xalqa, millətə, Vətənə, dövlətə təmənnasız xidmət edən fədakar, vətənpərvər şəxslər olmalıdırlar.






Təqdimat tədbirində çıxış edən ADPU-da SABAH qruplarının koordinator-rəhbəri Lalə Mürsəlbəyova könüllülər hərəkatının yaranma tarixinə nəzər salaraq bildirib ki, bu hərəkat beynəlxalq xarakter daşıyır. Könüllülər hərəkatı ilk dəfə XX əsrin 20-ci illərində Avropada fransız və alman gəncləri tərəfindən Birinci Dünya müharibəsinin nəticələrini aradan qaldırmaq məqsədilə yaradılıb. ABŞ-da bu hərəkat prezident Franklin Delano Ruzveltin təşəbbüsü ilə ötən əsrin 30-cu illərində təşəkkül tapıb. Keçən əsrin 60-cı illəri isə ABŞ-da bu hərəkatın ikinci mərhələsi kimi səciyyələndirilir. Könüllülər hərəkatı həmin dövrdə Şərqi və Qərbi Avropa arasında sülhü dəstəkləmək üçün fəaliyyət göstərib. 70-80-ci illərdə ABŞ-da bu hərəkat zəifləyib. 1993-cü ildən bu yana isə ABŞ-da könüllülər hərəkatı yenidən canlanıb. Könüllülər hərəkatı müxtəlif istiqamətlərdə fəaliyyət göstərə bilər. Təhsil, səhiyyə, idman, turizm, ekologiya, kənd təsərrüfatı və digər sahələr burada üstünlük təşkil edir. Eyni zamanda tarixi abidələrin bərpası, müxtəlif sosialyönümlü proqramlar, autizm və daun xəstəliklərindən əziyyət çəkən uşaqlara kömək etmək də könüllülərin fəaliyyət dairəsinə daxildir. Könüllü olmaq gənclərə təcrübə toplamaq, şəxsiyyət və lider kimi formalaşmağa kömək edir.

L.Mürsəlbəyova çıxışına davam edərək bildirib ki, iyun ayında ölkəmizdə keçiriləcək Birinci Avropa Olimpiya Oyunlarında 60-dan çox ölkənin dövlət nümayəndələrinin iştirak etmələri nəzərdə tutulur. Bu oyunlarda 20 idman növü üzrə 6 mindən çox idmançı iştirak edəcək. Bakıda keçiriləcək Birinci Avropa Olimpiya Oyunları dünyanın idman tarixinə möhtəşəm bir hadisə kimi daxil olacaqdır. L.Mürsəlbəyova çıxışının sonunda digər tələbə-gənclərə də Birinci Avropa Olimpiya Oyunlarında könüllü olmağı tövsiyə edib.

Təqdimat mərasimində ADPU-nun SABAH qruplarında İbtidai sinif müəllimliyi ixtisası üzrə təhsil alan II kurs tələbəsi, SABAH könüllülərinin supervayderi Həmidə Rzayeva və digərləri çıxış edərək öz tələbə yoldaşlarını könüllü olmağa çağırıblar. Tədbirin sonunda SABAH könüllülərinin fəaliyyətini əks etdirən slayd təqdim olunub.

**Könül NƏRİMANQIZI**

# Autizmli uşaqlara həsr olunmuş “Mələklərin sözü var” adlı tələbə elmi seminarı

Aprel ayının 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik zalında Pedaqogika və psixologiya fakültəsinin təşkilatçılığı ilə universitetdə autizmli uşaqlara həsr olunmuş “Mələklərin sözü var” adlı tələbə elmi seminarı keçirilib. Elmi seminarı ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev açaraq bugünkü seminarın aktual bir mövzuya həsr olunduğunu bildirib. Çünki sağlamlıq imkanları məhdud olan və eləcə də xüsusi qayğıya ehtiyacı olan uşaqlar həmişə cəmiyyət həyatının ən həssas, ən ağrılı və eyni zamanda ən çox diqqət tələb edən sahələrindən biridir. Professor V.Əliyev qeyd edib ki, ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun universitetdə respublika elmi-praktik konfranslarının keçirilməsi ilə bağlı imzaladığı müvafiq əmrə əsasən ADPU-nun Təhsil Problemləri İnstitutu ilə birlikdə aprel ayının 17-də “Xüsusi qayğıya ehtiyacı olan uşaqların cəmiyyətə inteqrasiyası və sosial ataptasiyası” mövzusunda keçirəcəyi respublika elmi-praktik konfransı da bu zərurətdən irəli gələn və xeyirxah məqsədə xidmət edən mühüm bir elmi toplantı olacaqdır.





Elmi seminarda çıxış edən Ümumi psixologiya kafedrasının baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Səbinə Aslanova autizm xəstəliyinin mənşəyindən və mahiyyətdən danışaraq bildirib ki, autizm üç yaşından əvvəl başlayan və ömür boyu sürən, ictimai qarşılıqlı təsirə və ünsiyyətə zərər verən, məhdud və təkrarlanan davranışlara gətirib çıxaran, beynin inkişafına mane olan bir xəstəlikdir. Bu əlamətlər autizmi, Asperger sindromu kimi daha yüngül görünən autistik spektrum pozuqluğundan (ASP) ayırır. Autizm irsi mənşəlidir, ancaq irsiliyi olduqca qarışıqdır və ASP-nin mənşəyinin çoxlu gen qarşılıqlı təsirlərindənmi, yoxsa nadir görünən mutasiyalardanmı qaynaqlandığı çox da dəqiq deyil. Nadir hallarda doğum şikəstliklərinə səbəb olan amillərlə yaxından əlaqəlidir. Digər görüşlərə görə isə, uşaqlıqda edilən peyvəndlər kimi səbəblər mübahisəlidir və peyvənd mənşəli fərziyyələrin razısalıcı elmi dəlilləri yoxdur. Autizm beyinə təsir edir, amma bu təsirin necə inkişaf etdiyi məlum deyil. Valideynlər, ümumiyyətlə, uşaqlarının həyatının ilk iki ilində bunun əlamətlərini hiss edirlər. Erkən davranış, ya da qavrayış müdaxilələri uşaqların özünə baxa bilmə bacarığı ilə ictimai və ünsiyyət bacarıqları qazanmasına köməkçi ola bilər. Autizmin çarəsi yoxdur. Autizmli uşaqların çox az hissəsi yetkin yaşa çatdıqdan sonra sərbəst həyatda bundan xilas ola bilirlər.

Autizm bugünkü mənasında ilk dəfə 1938-ci ildə Vyana Universitet Xəstəxanasında Hans Aspergerin uşaq psixologiyası üzrə almanca apardığı bir dərsdə Bleulerin “autistik psixopatlar” terminologiyası ilə istifadə edilmişdir. Bu sindrom müxtəlif səbəblərə görə 1981-ci ilə qədər ayrı bir diaqnoz kimi tanınmamışdır. Qeyd edək ki, autizm 1980-ci illərdən bu yana çox artmışdır. Bunun səbəbi qismən diaqnoz qoyma üsullarındakı dəyişikliklərdir; gerçək prevalansın artıb-artmadığı məlum deyil. Hazırda dünyada 70 minə yaxın insan bu xəstəlikdən əziyyət çəkir. Azərbaycanda isə bu gün orta hesabla 3500 nəfər autizm xəstəsi var. Ölkəmizdə autizm xəstəliyindən əziyyət çəkən şəxslərin sosial müdafiəsi dövlət tərəfindən təmin edilir və bununla bağlı bir sıra lahiyələr həyata keçirilir. Onu da qeyd edək ki, 2 aprel bütün dünyada Beynəlxalq Autizm Günü kimi qeyd edilir.

Elmi seminarda ADPU-nun Ümumi psixologiya kafedrasının dosenti, psixologiya üzrə fəlsəfə doktoru Tamilla Ağayeva və baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Nailə Hüseynova, eləcə də Korreksiyaedici təlimin metodika və metodologiyası ixtisası üzrə təhsil alan I kurs magistrantları Günay Bədəlzadə, Fatma Məmmədova, Sevda Məhərrəmova, Səmra Bayramova, Bəyim Həsənova, Sülhanə Bəşirova, II kurs magistrantları Məhsəti Qəmbərova, Aygün İsmayılova, II kurs bakalavrı Birol Özkaya, həmçinin məzunları Xanım Bədəlova, Vəfa Şahgəldiyeva çıxış edərək autizmin etiologiyası və simptomokompleksi, autizm zamanı psixi proseslər, autizmin təsnifləşdirilməsi və sindromları, klassik autizm-Konner sindromu, asperger sindromu, Rett sindromu, atipik autizm, autizm və hiperaktivlik, autizmin diaqnostikası, autizm zamanı korreksion iş prosesləri ilə bağlı ətraflı danışmış, öz elmi fikir və mülahizələrini bölüşmüşlər.

**Gülnar SÜLEYMANOVA**

## SABAH qruplarına qəbul üzrə müsabiqənin I mərhələsi keçirilib

Aprelin 12-də 2015-2016-cı tədris ili üçün SABAH qruplarına qəbul üçün müsabiqənin I mərhələsi keçirilib.

Azərbaycan Dövlət İqtisad Universitetinin I tədris binası və 132-134 nömrəli təhsil kompleksində keçirilən müsabiqənin bu mərhələsində 1630 nəfər I kurs tələbəsi iştirak edib.

Bu mərhələdə namizədlər məntiqi dünyagörüş və ingilis dili üzrə bilik və bacarıqları qiymətləndirən 50 test tapşırığını 90 dəqiqə ərzində cavablandırıblar. Müsabiqə mərhələsində müvafiq nəticə göstərən namizədlər növbəti mərhələdə - müsahibədə iştirak etmək hüququ qazanıblar.

Qeyd edək ki, SABAH qruplarının formalaşdırılması ali təhsil sistemində keyfiyyətin artırılması istiqamətində həyata keçirilən önəmli tədbirlərdən biridir.

# Kitabxanamız zənginləşir

1. İlham Əliyev "İnkişaf-məqsədimizdir". On altıncı kitab. Mart 2006-May 2006, Bakı, "Azərnəşr", 2014, 376 s.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin oxuculara təqdim olunan bu cildində Dünya Azərbaycanlılarının II Qurultayında nitqi, Azərbaycanda sənaye və kənd təsərrüfatı sektorunun hərtərəfli inkişafı yolunda geniş iqtisadi islahatların aparılmasına, sərmayələrin cəlb edilməsinə, regionların sosial-iqtisadi inkişafına, eyni zamanda iqtisadi-siyasi həyatın digər məsələlərinə dair çıxışları, nitq və tövsiyələri və s. toplanmışdır.

2. İlham Əliyev "İnkişaf-məqsədimizdir". On yeddinci kitab. May 2006-İyun 2006, Bakı, "Azərnəşr", 2014, 392 s.

Kitabda Azərbaycan Prezidenti İlham Əliyevin GUAM-ın üzvü olan ölkələrin dövlət başçılarının Kiyev zirvə görüşündə, Fransaya səfəri zamanı NATO Parlament Assambleyasinin yaz sessiyasında, Rumıniyaya səfəri zamanı "Dialoq və tərəfdaşlıq naminə" Qara dəniz forumunda çıxışları, KİV-lərə verdiyi bəyanat və müsahibələri dərc olunmuşdur.

3. İlham Əliyev "İnkişaf-məqsədimizdir". On səkkizinci kitab. İyun 2006 - Avqust 2006, Bakı, "Azərnəşr", 2014, 424 s.

Kitabda Azərbaycan Prezidenti İlham Əliyevin ölkəmizdə ətraf mühitin mühafizəsi, regionlarin sosial-iqtisadi inkişafı, gənc nəslin milli-mənəvi dəyərlərə bağlılığı və intellektual səviyyəsinin yüksəldilməsi, idmanımızın dünya səviyyəsində inkişafı, eyni zamanda ictimai-siyasi həyatın digər məsələlərinə həsr olunmuş çıxış və nitqləri geniş yer tutmuşdur.

4. "Azərbaycanın Regionları". Statistik məcmuə. Bakı, 2014, 778 s.

Bu məcmuədə ölkənin hər bir rayonu ayrı-ayrılıqda iqtisadi rayonlar üzrə qruplaşdırılaraq, 2009-cu ildə keçirilmiş Azərbaycan Respublikasının Milli Siyahıyaalınmasının mühüm göstəriciləri, sosial-iqtisadi vəziyyəti xarakterizə edən statistik göstəricilər, rayonların xəritəsi və qısa coğrafi məlumatları təqdim olunur.

5. Paşayev A.M., Ağayeva S.X. "NANO materiallar, tədqiqat üsulları, cihazlar". Dərs vəsaiti. Bakı, 2012, 332 s.

Dərs vəsaiti Təhsil Nazirliyinin ali texniki təhsil müəssisələrində nanotexnologiya və nanoelektronika tədris proqramlarına uyğun hazırlanıb.

6. Əmirov M. "Tarix üzrə dərsdənkənar iş". Dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi, 2014, 116 s.

7. Vəliyev X.R. "Dövlət ittihamının müdafiə edilməsinin müasir problemləri". Dərs vəsaiti. Bakı, "Hərbi nəşriyyat", 2014, 472 s.

Dərs vəsaitində dövlət ittihamının anlayışı verilmiş, dövlət ittihamçısı və ittihamın digər subyektlərinin prosessual-hüquqi vəziyyəti izah edilmiş, dövlət ittihamının müdafiəsində beynəlxalq hüquq normaları və beynəlxalq təşkilatların rolu araşdırılmışdır.

8. Əfəndiyeva Ü. "Müəllim şəxsiyyətinin psixologiyası". (metodik vəsait). Bakı, ADPU-nun mətbəəsi, 2014, 120 s.

Metodik vəsaitdə müəllim şəxsiyyətinin psixoloji xüsusiyyətləri geniş araşdırılmış, müəllimin əməyi psixoloji cəhətdən təhlil edilmiş, müəllim şəxsiyyətinə verilən psixoloji tələblər, onun ümumi və xüsusi qabiliyyətləri, müəllimin fəaliyyətində fərdi üslub son tədqiqatlara əsaslanaraq təqdim edilmişdir.

9. Yusifov F. "Ədəbiyyatın tədrisi metodikası". Ali məktəblərin filologiya fakültələrinin bakalavriat təhsil səviyyəsi tələbələri üçün dərslik. Bakı, ADPU-nun mətbəəsi, 2014, 293 s.

Dərslikdə ədəbiyyat tədrisi metodikası fənninin mühüm bölmələri əhatə olunmuş, fəal/ interaktiv təlimin ədəbiyyat dərslərinə tətbiqi imkanlarina geniş yer ayrılmış, milli və fənn kurikulumlarına dair ədəbiyyat müəllimlərinə gərəkli ola biləcək məlumatlar verilmişdir.

10. Verdiyeva M. "İqtisadi və sosial coğrafiyanın tədqiqat metodları". Bakı, ADPU-nun mətbəəsi, 2014, 158 s.

Təqdim olunan dərs vəsaiti pedaqoji universitetlərdə müəllim hazırlığı ixtisasının bakalavr və magistr pilləsinin tələbələri, gənc tədqiqatçılar üçün nəzərdə tutulmuşdur.

11. Məcidova B. "Orta məktəbdə tarixin tədrisinin metodikasına dair". (metodik vəsait). Bakı, ADPU-nun mətbəəsi, 2009, 107 s.

Metodik vəsaitdən ali məktəblərin tarix fakültəsinin tələbələri və orta məktəblərin tarix müəllimləri istifadə edə bilərlər.

12. Qafarova O. "Həyat bilgisi və onun tədrisi metodikası" fənni üzrə təlimin təşkili xüsusiyyətləri". (metodik vəsait). Bakı, ADPU-nun mətbəəsi, 2014, 107 s.

13. Mehdiyev A.Y., Salmanov İ.R., Hacıyev M.S., Babayev Ə.H. "Astronomiyadan laboratoriya praktikumu". 1 hissə. Universitetlərin fizika-riyaziyyat fakültələrinin tələbələri üçün dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi, 2013, 120 s.

14. Əhmədova N.Ə. "Qafqaz Albaniyası tarixinin problemləri". Dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi, 2014, 247 s.

Vəsait e.ə. 1V əsrdən-eramızın V111 əsrinədək olan xronoloji çərçivəni, yəni Qafqaz Albaniyasinin mövcudluğu dövrünü əhatə edir.

15. Əhmədli S. "Başdaşı əhvalatı". Bakı, "B-Print", 2014, 200 s.

16. Kərimov Y.Ş. "Ana dilinin tədrisi metodikası". Dərslik. Bakı, "Kövsər" nəşriyyatı, 2011, 564 s.

17. Taisoğlu T. "Yol ağardıram". (Şeirlər). Bakı, "Azərnəşr", 2009, 256 s.

Bu kitaba müəllifin müxtəlif illərdə yazdığı, indiyədək cap olunmamış şeirləri toplanmışdır.

18. Əsəd Rza Yəqubi "İnsan və həyat". Bakı, "Səda" nəşriyyatı, 2014, 206 s.

Təqdim edilən "İnsan və həyat" adlı bu kitab müxtəlif illərdə qələmə alınmış məqalələr toplusundan ibarətdir.

19. Rəhimoğlu İ. "Bu da...bir ömürdü yaşadım". Bakı, "Avropa"nəşriyyatı, 2012, 274 s.

"Bu da...bir ömürdü yaşadım" kitabında Vətən, torpaq, yurd sevgisi, Bütöv Azərbaycan arzusu, Qarabağ dərdi, məhəbbət, həsrət mövzuları və digər mövzularda yazılmış şeirlər yer almışdır.

20.Məmmədov V.R., Əsədov N.N. "Azərbaycan tarixi fənnindən kurs və sər-bəst işlərin hazırlanmasına dair metodik göstəriş". Bakı, ADPU-nun mətbəəsi, 2014, 63 s.

21. "Milli Atlas". /Azərbaycan Respublikası/. Bakı, 2014, 443 s. (Dövlət Torpaq və Xəritəçəkmə Komitəsi).

22. Vahidov T., Vahabov İ., Vahidov A. "Fizika". Təcrübə nümayişləri, labo-ratoriya işləri, praktikumlar. Dərs vəsaiti. Bakı, "Təhsil", 2009, 176 s.

Vəsait, əsasən, ali pedaqoji universitetlərin müvafiq fakültələrinin tələbələri və orta məktəb müəllimlərinin istifadəsi üçün nəzərdə tutulmuşdur.

23. Vahidov A.T., Qasımov İ.İ., Vahidov T.S. "Fizika elmi-texniki məlumatlarla". Dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi, 2014, 365 s.

Kitabdan ali, orta ixtisas və orta məktəbdə təhsilalanlar və müəllimlər istifadə edə bilər.

24. Kazımov N. "Məktəb pedaqogikası". Dərslik. (Ali pedaqoji məktəblərin bakalavr pilləsi tələbələri, habelə aspirant və dissertantlar, müəllimlər üçün). Bakı, "Çıraq", 2011, 440 s.

25."Doktorantların və gənc tədqiqatçıların XV1 Respublika Elmi Konfransının Materialları. 1 hissə. Bakı, "Müəllim" nəşriyyatı, 2012, 469 s.

26."Doktorantların və gənc tədqiqatçıların XV1 Respublika Elmi Konfransının Materialları. 11 hissə. Bakı, "Müəllim" nəşriyyatı, 2012, 448 s.

27. Əmirov M. "Tarix dərslərində şagirdlərdə elmi dünyagörüşünün formalaşdırılması". "Tarixin tədrisi metodikası və metodologiyası" ixtisası üzrə magistr hazırlığı üçün dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi, 2014, 126 s.

28.Əlizadə Ş. "Kurikulum üzrə fizikadan dərs nümunələri". (V1-1X siniflər üçün). Metodik vəsait. Bakı, 2014, 106 s.

Metodik vəsait fizika fakültəsinin tələbələri, magistrlər, tədqiqatçılar və orta ümumtəhsil məktəblərinin fizika müəllimləri üçün nəzərdə tutulmuşdur.

29. "Müasir təhsilin aktual sosial-psixoloji problemləri". Bakı, "Mütərcim", 2014, 256 s.

Kitabda müasir təhsilin aktual sosial-psixoloji problemlərinin nəzəri və praktik məsələləri öz əksini tapmışdır.

30. Rəhimova S. "Məktəbəqədər yaşlı uşaqların sosial-mədəni tərbiyəsinin təşkili". Bakı, "Nasir"nəşriyyatı, 2010, 124 s.

Vəsaitdə məktəbəqədər təhsil müəssisələrində uşaqların sosial-mədəni tərbiyəsi üzrə işin təşkili, məzmunu və bütün qruplar üzrə məşğələ nümunələri, uşaqların sosial-mədəni tərbiyəsində uşaq bağçası ilə ailənin birgə işi şərh edilmişdir.

31."Azərbaycan dilinin orfoqrafiya lüğəti". Genişləndirilmiş və yenidən işlənmiş 6-cı nəşr. Bakı, "Şərq-Qərb" Nəşriyyat Evi, 2013, 840 s.

32. Abdullayeva G.A. "Ana dilinin tədrisi metodikası". (Nitqin ifadəliliyi üzrə). Pedaqoji fakültə tələbələri üçün dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi, 2014, 112 s.

33. Sadıqova T., Rəhimova S., Kərimova A. "Məktəbəqədər təhsil müəssisələrində nitq inkişafı məşğələləri". (Böyük və məktəbəhazırlıq qrupları). Metodik vəsait. Bakı, "Nasir"nəşriyyatı, 2012, 203 s.

Məktəbəqədər təhsil müəssisələrində nitq inkişafı məşğələləri məktəbəqədər tərbiyə müəssisələrinin tərbiyəçiləri, müdirləri, universitetlərin müvafiq fakültələrinin tələbələri, magistr və dissertantları, valideynlər üçün nəzərdə tutulmuşdur.

34.Məmmədova Ş.N. "Uşaq ədəbiyyatı (Mirvarid Dilbazinin uşaq yaradıcılığı)". Dərs vəsaiti. Bakı, ADPU-nun nəşriyyatı, 2014, 187 s.

Kitabda Sovet dövründə yaşamış görkəmli Azərbaycan şairi Mirvarid Dilbazinin həyatından və uşaq əsərlərindən danışılır. Əsərdə şairin uşaq ədəbiyyatı ilə əlaqəli həm nəzəri-estetik fikirləri, həm də bədii yaradıcılığı bir bütöv halında təhlilə cəlb edilir.

35. Hikmət Mahmud "Karvan yolu". Bakı, "Uniprint", 2014, 276 s.

36. Feyzullayeva T.Ə. "Pediatriyanın və məktəbəqədər yaşlı uşaqların gigiyenasının əsasları". Dərs vəsaiti. Bakı, ADPU-nun nəşriyyatı, 2014, 111 s.

Vəsait məktəbəqədər təhsil müəssisələrin gələcək tərbiyəçilərini, həm də 6 yaşlı uşaqlara dərs deyəcək gələcək müəllimləri, erkən və məktəbəqədər yaşlı uşaqların anatomik-fizioloji xüsusiyyətləri, onların xarici mühitinin düzgün təşkili, uşaq xəstəlikləri və s. haqda biliklərlə məlumatlandırır.

37. "Azərbaycan paytaxtları". (Elmi-praktik konfrans). Məqalələr toplusu. Bakı, "Elm və Təhsil", 2014, 280 s.

38. "Azərbaycan paytaxtları". (Elmi-praktik konfrans). Tezislər toplusu. Bakı, "Elm və Təhsil", 2014, 68 s.

39. Bayramova R. "Asiya və Afrika ölkələri tarixi". (Yaxın və Orta Şərq ölkələrinin müasir dövrü). Bakı, "Elm və Təhsil", 2013, 244 s.

40. Cəfərova L.K., Qafarova İ.X., Muradova K.Z., Rəhimova S.Ə. "Məktəbə-qədər təhsil müəssisələri üçün təlim materiallarinin təxmini planlaşdırılması". Bakı, Təhsil Problemləri İnstitutunun, Təhsil Texnologiyaları Mərkəzinin nəş-riyyatı, 2014, 120 s.

Metodik tövsiyədə məktəbəqədər təhsil müəssisələri üçün planlaşdırmanın mahiyyəti, aparılması texnologiyası, eləcə də inkişaf sahələri və yaş qrupları üzrə təxmini planlaşdırma nümunələri əhatə olunmuşdur.

41. "Müasir uşaq bağçalarında təlimin təşkili". Bakı, "Apostrof" Çap Evi, 2011, 96 s.

Vəsaitdə məşğələlərə əsas didaktik vahid kimi xüsusi diqqət yetirilir: uşaqların yaş meyarlarına əsasən məşğələlərin təşkili, ona verilən tələblər, qiymətləndirmənin aparılması və qiymətləndirmə meyarları təqdim olunur.

42. "Uşaq bağçası müdirinin stolüstü kitabı. Müasir uşaq bağçalarında təlimin təşkili". Bakı, "Apostrof" Çap Evi, 2011, 272 s.

Kitaba əsas normativ-hüquqi sənədlər, məktəbəqədər təhsil müəssisələrində əsas sənədlər və bu sistemdə işləyən mütəxəssislərin vəzifə təlimatları, uşaq bağçalarında metodik işin təşkili, valideynlərlə işin forma və metodları və idarəetmə məsələləri ilə bağlı materiallar daxil edilmişdir.

43.Əhmədov H.M. "Azərbaycan məktəb və pedaqoji fikir tarixi". (rus dilində). Bakı, "Texcul", ABU, 2002, 360 s.

44.Baykal M. «İstoki Kitayskoy üivilizaüii». Vaku, "Qanun" nəşriyyatı, 2014, 256 str. s illöstraüiəmi.

**Fəridə Məmmədova,**
**Elmi kitabxananın məlumat-biblioqrafiya şöbəsinin böyük biblioqrafı**

## "Nə?, Harada?, Necə?" adlı məntiq yarışı keçirilib

Aprel ayının 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi kitabxanasının oxu zalında ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsinin və Tələbə Həmkarlar Təşkilatının "İntellektual oyunlar klubu" nun təşkilatçılığı ilə universitetin 10 fakültəsinin tələbələri arasında "Nə?, Harada?, Necə?" adlı



məntiq yarışı keçirilib. Məntiq yarışında hər biri 6 nəfərdən ibarət 10 komanda iştirak edib. Iki turdan ibarət olan yarışda komandalara hər mərhələdə elm, məntiq, idman, mədəniyyət, incəsənət və digər sahələrə aid 12 sual, bütövlükdə isə 24 sual verilib. Yarışda Tarix fakültəsinin "Tarix" komandasının tələbə-gəncləri daha yüksək bilik nümayiş etdirərək 1-ci yerə, Filologiya fakültəsinin "Kamillər" komandası 2-ci yerə, Kimya fakültəsinin "Gənc kimyaçılar" komandası isə 3-cü yerə layiq görülüblər. Yarışda 1-ci yeri tutan Tarix fakültəsinin "Tarix" komandasına kubok, kitablar və diplomlar hədiyyə edilib. 2-ci və 3-cü yerləri tutan Filologiya fakültəsinin "Kamillər" və Kimya fakültəsinin "Gənc kimyaçılar" komandaları isə diplomla təltif ediliblər.

**"Gənc müəllim"**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Biologiya fakültəsinin dekanı, professor Yusif Əhmədova əzizi

**Ziyəddin müəllimin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının müdiri Oktay Alxasova anası

**Bəstinazın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fizikanın tədrisi metodikası kafedrasının dosenti İsa İsmayılova qardaşı

**Heydər İsmayılovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Rəsm, heykəltaraşlıq və boyakarlıq kafedrasının dosenti Sima Ağayevaya bacısı

**Ema xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi "Dədə Qorqud elmi-tədqiqat laboratoriyası"nın böyük elmi işçisi, dosent

**Akif Əliyevin**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İstehsalatın əsasları kafedrasının baş müəllimi

**Ənvər Quliyevin**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının müəllimi Zaman Məmmədova əzizi

**Vaqif Məmmədovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasının baş müəllimi Fəzilə Məmmədovaya və Tədris-metodika şöbəsinin əməkdaşı Firuzə Salmanovaya bacıları

**Fəridə xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının baş müəllimi Rafiq Alıyevə anası

**Sayad xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor əvəzi: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1566
Sayı: 1500
Çapa imzalanıb: 30.04.2015-ci il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.